## Müəllif Haqqında

Muhamməd Avvamə 24 yanvar 1940-cı ildə Suriyanın Hələb şəhərində anadan olmuşdur. Hələb şəhərinin "Şabaniyyə" mədrəsəsindən məzun olduqdan sonra, Şam Universiteti Şəriət fakultəsində təhsilini davam etdirmişdir. Universiteti bitirdikdən sonra 1979-cu ildə Mədinə şəhərinə hicrət edənə qədər "Şabaniyyə" mədrəsəsi Şəri Elmlər İnistutunda müəllimlik etmişdir.

Professor Muhamməd Avvamə Səudiyyə Ərəbistanına köçdükdən sonra, Mədinə İslam Universiteti və Ciddədə yerləşən kral Abdulaziz Universitetində tədris fəaliyyətlərinə davam etmişdir.

Məşhur Osmanlı alimi Muhamməd Zahid əl-Kövsərinin elmi metodunu davam etdirən Professor Muhamməd Avvəmə, ən çox Şamın məşhur muhəddis və müfəssirlərindən olan Abdullah Siracuddin və Zahid əl-Kövsərinin ən məşhur tələbəsi Abdulfəttah əl Ğuddədən təsirlənmişdir.

1959-cu ildə Misirə getmiş və Əhməd bin Muhamməd bin Sıddıq əl Ğuməri və əs Seyyid Abdullah əl Ğuməri kimi alimlər ilə tanış olmuşdur.

Hindistan və Pakistan alimləri ilə sıx əlaqələrdə olan Muhamməd Avvəmə, Həbiburrahman əl Azami, Muhamməd Zəkəriyyə əl Kandəhləvi, Muhamməd Abdurraşid ən-Numəni və başqa alimlərdən icazət almışdır.

Mədinədə elmi fəaliyyətlərini davam etdirməkdə olan Muhamməd Avvamənin çap edilmiş bir çox əsəri vardır.

# MÜQƏDDİMƏ

## Məzhəb İmamlarının Nəzərində Hədislərin Dəyəri

Onların hədisə bağlanma xüsusundaki şiddətli arzularını və hədislərlə əməl etməyə olan aşırı rəğbətlərini anlaya bilməyimiz üçün, imamlar nəzərində hədislərin dəyərini açıqlayacaq qısa bir müqəddiməyə ehtiyac vardır.

**İmam Əbu Hənifə** (80-150) belə demişdir: "İçlərində hədislə məşğul olanlar olduğu müddətcə insanlar qurtuluş  içərisindədirlər. Nə zaman ki, elmi hədisin xaricində axtararlarsa o zaman pozularlar."[1]

Yenə demişdir: "Allahın diniylə əlaqəli bir mövzuda şəxsi rəyinizə görə hökm verməkdən çəkinin, sünnəyə tabe olun. Kim sünnədən ayrılarsa doğru yoldan uzaqlaşar."[2]

**İmam Şafi** (150-204) demişdir: "Rasulullahdan sallahu aleyhi və səlləm bir hədis rəvayət etdiyim halda, o hədisdən başqa bir hökmə qənaət gətirsəm, məni hansı göy üzü kölgələndirər, hansı yerüzü daşıyar!"[3] Bir gün İmam Şafi hədis rəvayət edər, əl Humeydi (v.219) (Buxarinin şeyxidir): "bu hədisi qəbul edirsənmi?" - deyə soruşdu. İmam Şafi dedi: "Sən məni belimdə zünnarla kilisədən çıxarkənmi gördün, Rasulullahın bir hədisini eşitdiyim halda onu qəbul etməyim"[4] – deyə cavabını verdi.

1. İmam Şərani, Mizanul Kubra 1/51
2. Eyni qaynaq,1/51
3. İmam Subkinin "Məna Qavlil-İmamil-Muttalibi: İzə Sahhal-Hadisu fə huvə məzhəbi" adlı əsərinin müqəddiməsindən. Bunun xaricində də bir çox qaynaqda da zikr edilmişdir.
4. Eyni qaynaq,Müqəddimədən

**İmam Malikin** (95-179) sünnəylə əlaqəli bu bənzətməsi necədə gözəldir: "Sünnələr Nuhun gəmisidir, kim o gəmiyə minərsə qurtular, kimdə minməz isə boğular."[5] **İmam Əhməd b. Hənbəl** (164-241) belə demişdir: "Kim Rasulullahın hədisini rədd edərsə, o kimsənin həlak olmasına çox az qalmışdır."[6] Yenə belə demişdir: "İnsanların bu zamanki qədər hədis tələbinə möhtac olduqları bir dövr bilmirəm". Əshabından birisi niyə belə dediyini soruşdu? İmam da: "Bir çox bidətlər çıxdı. Kim hədisi bilməzsə bidətlərə düşər" - cavabını verdi.

Bunlar imamların mənaqib və tərcüməyi hallarına dair əsərləri bəzəyən sözlərdən bir neçəsidir. Bu sözlərin tək bir nöqtə üzərində durduğunu görürük. O da Rasulullahın sünnəsinə sarılmağın zəruri olmasıdır. Kim sünnəni öyrənərək onunla əməl edərsə onun qazanclı və qurtuluşa çatan kimsələrdən olduğu, hər kim də sünnədən üz çevirərsə, bunun xüsran və doğru yoldan ayrılma əlaməti olduğu vurğulanmaqdadır.

Müsəlmanın qəlbində və ağlında onların elmdə imam olduqlarına inanması yanında bütün imamlara qarşı belə bir düşüncə yerləşərsə, o təqdirdə o kimsənin hər biri sünnəyə yaxınlaşmaq üçün əzm sərf etməklə birlikdə o imamların şəri hökmlərdə nə üçün ixtilaf etdiklərini araşdırmasında bir bəis yoxdur. Fəqət onların imam olduqlarına inanmırsa, əksinə onlar insandır, biz də insanıq deyirsə və ya onların, boğulacaq olan bir kimsənin qurtuluş çarələri axtarması kimi, sahib olduqları rəylərin dəlillərini araşdırmaqla ömürlərini keçirdiklərinə inananlardan da deyilsə, o kimsə belə bir araşdırmaya lüzum görməyəcək, bilavasitə imamlar haqqında belə bir inanca sahib olmadığı üçün, özünü onlardan daha alim görərək imamlara hücuma keçəcəkdir.

Bundan sonra "İmamların İxtilaf Səbəblərinə" keçirəm.

5. Suyuti miftəhul cənnə, Xatimə
6. İbnul Cəvzi, Mənaqibul İmam Əhməd, s182

# I SƏBƏB

## Hədislərlə Əməl Edə Bilmək Üçün Lazım Olan Şərtlər

Birinci səbəblə əlaqəli olaraq nəzərə alınması lazım olan dörd xüsus vardır. Bunların ikisi sənəd, ikisi isə mətinlə əlaqədardır.

Bu dörd xüsus bunlardır:

1 – Hədisin səhih ola bilməsi üçün lazım olan şərtlərin bəzisində olan ixtilafları

2 – Əməl edə bilmək üçün hədisin səhih olması şərtmidir?

3 – Hədisin ləfizlərinin Rasulullahın (sallahu aleyhi və səlləmin) söylədiyi şəkildə təsbiti.

4 – Hədisdəki kəlmələrin oxunuşunun təsbiti.

**Birinci nöqtə:** Mövzudan tamamən uzaqlaşmamaq üçün bunu qısaca izah edim.

Alimlər səhih hədisin beş şərti olduğunda ittifaq etmişlərdir. Sənədin müttəsil[7] olması, ravinin adil olması, ravinin zəbt[8] sahibi olması, hədisin mətin və sənədinin şaz[9] olmaması və hədisin səhihliyinə zərər verəcək bir illətin olmaması.

---

7. Hədisin sənədində qopuqluğun olmaması.
8. Hafizəsinin qüvvətli olması.
9. Güvənilən bir ravinin, özündən daha güvənli olan başqa ravilərə müxalif olaraq rəvayət etdiyi hədisdir. Belə bir vəziyyətdə, daha güvənilən ravilərin rəvayət etdiyi hədis məhfuz, ona müxalif olan rəvayətə isə şaz deyilir.

## Sənədin müttəsil olması:

İttisal[10] üçün şərtin nə olduğunda muhəddislər ixtilaf etmişlərdir. Bu məsələ hədisçilərə görə ravi ilə şeyxi arasındakı “liqa məsələsi”[11] olaraq bilinir. İmam Buxari (194-256) və başqaları şeyx ilə ravinin bir dəfə də olsa görüşməsini şərt qoşmuşlardır. İmam Muslim (v.261) və digərləri isə imkan daxilində olmasını şərt qoşmuşlardır. Hətta İmam Muslim bu görüşün icma ilə sabit olduğunu demişdir. [12]

Belə olduğu halda İmam Muslim və onunla eyni görüşü bölüşən alimlərə görə səhih olan hədislər, İmam Buxariyə görə səhih deyildir. İttisal üçün Muslimin görüşünü qəbul edən fəqih, bu şəkildə müttəsil olan hədislə hökm edər və bu mövzudakı hədisin səhih olduğunu deyər. Halbuki İmam Buxarinin Muslimə muxalif olan görüşünü qəbul edən digər fəqihlər onu səhih qəbul etməzlər və beləliklə hədisi, fiqhi bir hökm çıxarmaq üçün dəlil olaraq qəbul etməzlər. Eyni ilə bu hədisə dayanaraq veriləcək hökmləri də fasid qəbul edərlər.

İttisal ilə əlaqəli digər bir xüsus mürsəl hədisdir. Bu mövzudaki ixtilaf bir az öncə qeyd edilən misaldakından daha genişdir. Tabeinin Rasulullaha istinad etdiyi hədislərə mürsəl deyilir. Belə hədislər muttasıl deyə isimləndirilməz. Lakin muttasıl olmaması hədisə zərər verib hədisdən hökm çıxarılmasına əngəl təşkil edərmi?

Mühəddislərin cumhuru mürsəl hədisin zəif olduğuna və dəlil olmayacağına qənaət gətirmişlərdir. Fəqihlərin cümhuru isə irsalın[13] hədisə zərər verməyəcəyini qəbul etmişlərdir. İmam Əbu Hənifə, İmam Malik və iki rəvayətdən birinə görə İmam Əhməd də bu görüşdədir. Buna əsasən fəqihlərə görə mürsəl hədis də höccətdir və onunla əməl edilər.

---

10. Hədisin isnadını meydana gətirən ravilərin, hədisi əvvəlki ravidən şəxsən almış olması və bu şəkildə o sənədin Peyğəmbər aleyhissəlama qədər kəsintisiz olaraq çatması deməkdir. Belə hədislərə müttəsil deyilir.
11. Ravi ilə hədis rəvayət etdiyi şeyxinin görüşməsi, bir məclisdə bir araya gəlməsi deməkdir.
12. Muqaddimətu Sahihi Muslim, 1/130 (Nəvəvi şərhi ilə birlikdə). Bunu Allamə Aliyyul Qari də “Müsnədul-İmam Əbu Hənifə”yə yazdığı şərhdə (s.5) cumhurdan nəql etmişdir.
13. İttisalın əksidir, hədisin sənədində ravinin düşməsi deməkdir.

İmam Şafi bu iki görüş arasında yol tutmuş və belə bir hədisin zəifliyinin çox az olduğu və mürsəl hədisi dəstəkləyəcək dörd xüsus olacağı halda mürsəl hədisin höccət olacağını demişdir.

Buna əsasən, üç imamın və ya onlardan birisinin, bu dörd dəstəkləyici xüsusdan birisiylə dəstəklənməmiş olan bir mürsəl hədislə dəlil olaraq qəbul etdikləri fiqhi hökmə, mühəddislərin cumhuru kimi İmam Şafi də muxalifdir.

Mürsəl hədislərin sayısı heç də az deyildir. Allamə Kövsəri: “Mürsəl olduğu üçün hədisin zəif olduğunu deyən birisi əməl edilmiş olan sünnənin yarısını atmış olar” - demişdir.[14]

Ancaq İmam Şafinin gətirdiyi şərtləri nəzərə alsaq bu hədislərin sayı çox azalmış olacaqdır.

## Ravinin adil olması:

Bu mövzudakı ixtilaf daha da genişdir. Ravidə olması lazım olan adillik sifətinin mahiyyəti barədə ixtilaf edilmişdir. Ravinin cərh edilməmiş bir müsəlman olması kifayət edirmi? Bu halda onun adil olduğuna hökm edilərmi?

Və ya buna, ədalətinin sabit olması şərti də əlavə edilərmi? Bu şərt olmazsa ona məstur[15] deyilərmi? Və ya bir imamın onun adil olduğunu deməsi kifayət edərmi, yoxsa hər ravinin iki imam tərəfindən adil olduğunun söylənməsi şərtmidir?

Bu nöqtədəki ixtilaflara, hansı xüsusların müsəlmanın ədalət sifətini qaldırıcı bir cərh səbəbi sayıla biləcəyinə dair ixtilaflar da əlavə edilməlidir. Bununla əlaqəli olaraq, açıqlanması və araşdırılması uyğun olmayan bir çox həqiqət var. İraqlı olması, rəy əhli olduğu və ya Mihnə hadisələri zamanı Quranın məxluq olduğunu qəbul

14. Tənibul Xatib, sh 153
15. Hədis üsulunda məstur: hədis tələbi vəya rəvayəti ilə tanınmış olduğu halda, haqqında “cərh və tədil” imamları tərəfindən tənqidi bir hökm verilmiş olmaqdan ötrü məchul (məstur) qalmış birindən ən az iki adil ravi tərəfindən hədis rəvayət edilərsə, bu şəxsə məstur vəya məchulu’l hal deyilər. Çünki bu şəxs haqqında adil olub olmadığına dair açıq bir hökm yoxdur.

etdiyi üçün neçə ravinin ədalət sifəti hədər edilmişdir. Bunlar ancaq bu elmi və bu elmin tarixini yaxşı bilən kimsələrin idrak edib çəkinə biləcəyi xüsuslardır.

Mühəddəis və Fəqih imamlardan birisi, bir ravinin adil olduğunu deyərkən, mühəddis və fəqihlərdən digəri də onu cərh etmişdir. Adil və ya zəif olduğunda ittifaq edilən ravilər, ixtilafa nəzərən çox azdır.

Bu ixtilaf səbəblərinə başqası da əlavə edilə bilər. Bu ixtilafların sahəsini, bir az öncə gördüyümüzdən də çox artırmaq olar. Bəzən ixtilaflı bir ravinin sayısı onlarla ifadə edilə biləcək qədər hədis rəvayət etdiyi olur. Bu halda o ravinin adil olduğuna meyl edənlər onun rəvayət etdiyi hədislərdən çıxan hökmləri qəbul edərlər. Onun cərh edilməsinə meyl edənlər isə bu rəvayətləri rədde dərlər. İxtilaf da buradan qaynaqlanmaqdadır. İxtilafa düşən tərəflərdən hər biri özünün sünnəni dəlil olaraq qəbul etdiyini, fiqh və hədis ilə əlaqəli ictihadlarında mühəddislərin qoyduğu qaydalara tabe olduğunu iddia etməkdədir. Əlbəttə, onların bu dediklərini heç kəs inkar edə bilməz.

## Səhih hədis üçün lazım olan şərtlərin gerçəkləşməsindəki ixtilaflar:

Ravinin zəbt sahibi ola bilməsi üçün İmam Əbu Hənifənin gətirdiyi bir şərtə diqqət çəkmək yerində olardı. Bu şərt, Ravinin bir hədisin ravisi sifətini qazandığı andan, özünə rəvayət etdiyi ana qədər olan müddət içərisində, hər hansı unutqanlığın ortaya çıxmaması şərtidir.[16] Bu sərt bir şərtdir. Əbu Hənifəni belə bir şərt qoymağa vadar edən, ravilərdə müşahidə etdiyi tərəddüd və tasarruflardır.[17] Belə bir şərt qoşmaqla, bəzi hədislərin zəif və ya səhih olduğunu qəbul etmədə başqalarından ayrılacaqdır.

---

16. Aliyyul Qari, Şərhu müsnədi Əbu Hənifə sh 3, İmam Tahavidən Əbu Hənifəyə uzanan bir isnad ilə

17. Tasarruf-ravinin həm mətin, həm də isnadda olan kəlmələr üzərində etdiyi dəyişiklikləridir. Bu xüsus, ravinin, hədisin ləzfizlərini nöqsansız bir şəkildə əzbərləyə bilmədiyini göstərir və hədisin zəiflik səbəbi sayılır.

**İkinci Nöqtə:** Əməl edilə bilməsi üçün hədisin səhih olması şərtmidir? Bunun cavabı belədir: Hədis səhih və ya həsən dərəcəsinə çatarsa əməl edilməyə və şəri hökmlər çıxarmağa əlverişli olacağında alimlər ittifaq etmişlərdir. Zəif hədis isə alimlərin cümhuruna görə, bu hədislərlə fəzilətlər və müstəhəblərə yönəlik mövzularda (bunun üçün gərəkli şərtlərdə mövcud olduğunda) əməl edilə biləcəyi görüşündədirlər. Bu billinən bir məsələdir. Lakin bəzi imamlar, zəif hədislər ilə şəri hökümlər, yəni halal və haram mövzularında da əməl edilə biləcəyini qəbul etmişlər və hətta zəif hədisi islam alimlərinin əksəriyyətinin və bəlkə də muxaləfətinə etibar edilməyən bir neçəsi xaric tamamının, şəriətin qaynaqlarından biri olduğunu qəbul etdikləri qiyasa tərcih etmişlərdir.

Bu halda zəif hədis ilə əməl etmək, müctəhidlərdən üç imamın, Əbu Hənifə, İmam Malik və Əhmədin[18], eyni zamanda Əbu Davud, Nəsai, İbn Əbi Hatim kimi hədis imamlarının da məzhəbidir.[19]

Lakin bunun iki şərti vardır. Hədis çox zəif olmayacaq və bir məsələdə ondan başqa bir hədis olmayacaq.

İmam Əhmədin oğlu Abdullah belə demişdir: “Atama bir adam bir bəldədə olub və orada səhihi ilə zəifini ayırd edə bilməyən bir hədis əhli və bir də rəy əhli olarsa, bir məsələ ilə qarşılaşarsa məsələni hansına soruşar” - dedim. Atam mənə: “Hədis əhlinə soruşar, rəy əhlinə soruşmaz. Çünki hədisin zəifi belə rəydən daha qüvvətlidir” - cavabını verdi.[20]

İmam Şafi, bir məsələdə başqa bir hədis olmadığı zaman mürsəl hədisi zəif qəbul etdiyi halda onunla əməl edərdi. İmam Şafidən bunu imam Mavərdi kanalı ilə əs Səxavi  Fəthul Muğisdə 1/20, 142, 268-ci səhifələrdə nəql etmişdir.

Zəif hədis ilə əməl edə biləcəyimiz digər bir sahə də budur ki: bir hədis, ikisindən birisinin tərcih edilməsi mümkün olmayan iki mənaya gələ biləcək ləfzlə gələrsə, iki tərəfdən birisini tərcih etməyi

18. Aliyyul Qari, Mirqatul Məfətih Şərhu Mişqatil Məsabih 1/19
19. əs Səxavi, Fəthul Muğis 1/80,267
20. İbn Hazm,əl Muhalla 1/68, əs Səxavi, Fəthul Mugis 1/80

gərəkdirəcək zəif bir hədis olarsa, bu təqdirdə zəif də olsa, bu hədisin tərcih ediləcəyi mənanı qəbul edərik.[21]

Bu münasibətlə, günümüzdə bəzilərinin yaymağa çalışdığı görüşün əksinə, keçmiş imamlarımızın nəzərində zəif hədisin də bir dəyəri və etibarı olduğuna işarət edək. Çünki bu kimsələr zəif hədisi tamamilə geçərsiz saymışlar və mövzu hədislərə daxil edərək, ikisini ayrı səviyyədə tutmuşlardır.

**Üçüncü nöqtə:** Rasulullahın sözünün təsbiti məsələsidir. Bununla, Rasulullahın bir mənanı, ravayət edilən bir başqa ləfzlə deyil, gördüyümüz ləfzlərlə ifadə etdiyi xüsusunu təkid zərurətini qəsd edirəm. Bunun zəruri olması: bir hədis iki fərqli ləfzlə rəvayət edilib, hər bir ləfzdən çıxarılacaq olan hökümlər bir birindən fərqli olduğu zaman görülər. Bu məsələdə sərhədlərini ancaq bu mövzu ilə məşğul olan müətənid imamların biləbildiyi geniş bir ixtilaf sahəsi vardır.

Hədis və Üsul imamlarının istilahında bu məsələnin adı "Rivayətul Hadis bil Manadır." (Hədisin məna olaraq rəvayəti)

Elm əhlinin əksəriyyəti, məna olaraq rəvayəti caiz görmüşlər, lakin dəlalət etdiyi mənaların eyni olduğunu zənn edərək bir ravinin bir kəlməni, fərqli mənadakı başqa bir kəlmə ilə ifadə edəbiləcəyindən qorxaraq, məna olaraq rəvayət edən ravinin ərəb dilini yaxşı bilməsini və kəlmələrin mənalarına vaqif olmasını şərt qoşmuşlardır.[22]

Lakin İmam Əbu Hənifə başqa bir şərt qoşar. Bu şərtin isabətli və əhəmiyyətli olduğunu bu işə girən bilər. Bu şərt, məna olaraq rəvayət edən ravinin fəqih olmasıdır.[23]

Ta ki ləfzlər üzərində edəcəyi dəyişikliyin doğuracağı nəticəni biləbilsin. Bu məsələ ilə bağlı iki misal verirəm.

**Birinci misal:** Əbu Davud, Avnul Məbud şərhində (3/182) İbn Əbi Zib yoluyla Saleh bin Nəbhan və Əbu Hüreyrədən rəvayət edir ki: "Rasulullah bir kimsənin məsciddə cənazə namazı qılmasında bir bəis yoxdur. (fəla şeyə aleyhi)" - buyurmuşdur.

21. İbnul Qayyim, Tuhfətul Məvdud bi Əhkəmil Məvlud, sh 29
22. Xatib əl Bağdadi, əl Kifəyə, sh. 167,198
23. Fiqhu əhlil iraq və hadisuhum, sh.35

Bəzi köhnə nüsxə və rəvayətlərdə ifadə bu şəkildədir. Bəzi rəvayətlərdə isə məsciddə cənazə namazı qılana savab yoxdur (fələ şey ə ləhu) şəklindədir.

Eyni ilə bu şəkildə bir rəvayət Abdurrazzaqın əl Musannəfində 3/527-də İbn Əbi Zib-Saleh-Əbu Hüreyrə yolu ilə rəvayət edilmişdir. Əbu Hüreyrə eyni rəvayətin sonunda ona əcir yoxdur (fələ şey ə ləhu) deməkdədir. Bu rəvayəti, İbn Əbi Şeybənin əl Musannəfindəki (4/152), eyni ilə İbn Əbi Zibdən rəvayət edilən bu hədis doğrulamaqdadır. Hədisin ifadəsi belədir: Məsciddə cənazə namazı qılanın əcri yoxdur. Əbu Hüreyrə belə dedi: "Rasulullahın əshabı yer tapa bilməsələr, namazı qılmaz və geri qayıdarlardı." İbn Macənin (1/486) İbn Əbi Zib yolu ilə rəvayət etdiyi hədisdə də ona savab yoxdur deyilməkdədir. Bu səbəblə Xatib məhfuz olan "ona savab yoxdur" şəklindədir demişdir. Necə ki Nəsbur Rəyədə də 2/275 bu şəkildədir.

Birinci rəvayətdəki, qılmasında bir bəis yoxdur rəvayətini qəbul edən imamlar, məsciddə cənazə namazının kərahətsiz caiz olduğunu demişlərdir. Bu İmam Şafi və başqalarının məzhəbidir.

İkinci rəvayətdəki, ona savab yoxdur ifadəsini qəbul edən imamlar isə, məsciddə cənazə namazı qılmağın məkruh olduğunu demişlərdir. Bu da İmam Əbu Hənifə və başqalarının məzhəbidir.

**İkinci misal:** İmam Buxari (2/257) və başqaları, İbn Əbi Zib-Zuhri-Said bin Museyyib-Əbu Hüreyrə yolu ilə Rasulullahın "İqaməni eşitdiyiniz zaman namaza gediniz. Yolda sakin və vüqarlı yeriyin, tələsməyin. Çatdığınız rükətləri qılar, çatmadıqlarınızı tamamlayarsınız (fə ətimmu)" - dediyini rəvayət etmişlərdir.

Bu hədisi, Abdurrazzaq, əl Musənnəfində (2/287) və İmam Əhməd əl Müsnədində (2/270), Abdurrazzaq-Mamər-Zuhri-Said bin Museyyib-Əbu Hüreyrə yolu ilə çatmadıqlarınızı qəza edərsiniz (və mə fətəkum fəqdu) şəklində rəvayət etmişlərdir.

İki rəvayətdəki tək bir kəlmənin tamamlayın və qəza edin şəklində fərqli olması, fiqhi baxımdan mühim ixtilaflara səbəb olmuşdur.

**İxtilaf budur:** Namaza imamla bərabər başlamamış olan birisi, dördüncü rükətə çatıb bu rükəti imamla bərabər qılmış olarsa, çatmadığı üç rükəti necə qılacaqdır?

**Birinci görüş:** Tamamlayın rəvayətinə görə o kimsə imamla qıldığı rükəti, imamına nisbətən dördüncü rükət olmasına baxmayaraq, özünə nisbətdə birinci rükət qəbul edər və imam salam verəndə ikinci rükəti qılar, çünki o namazını tamamlamaqdadır. Bu rükətdə fatiha və zəmmi surə oxuyar, subhənəkə duasını oxumaz, təknaşına qıldığı zaman nə oxumalıdırsa onları oxuyar. Beləcə ikinci rükəti qıldıqdan sonra təşəhhüdə oturar. Sonra qalxar qalan iki rükəti qılaraq namazını tamamlayar. Bu son iki rükətdə sadəcə fatiha oxuyar. Bu bir qrup alimin məzhəbidir. İmam Şafidə bu rəy üzərinədir.

**İkinci görüş:** Qəza edərsiniz rəvayətinə görə isə o kimsə imamla qıldığı namazı gərək imamına gərək də özünə nisbətlə dördüncü rükət olaraq qəbul edər, imam salam verəndə qalxar və bir rükət qılaraq bunu birinci rükət sayar. Çünki o imamla qılmadığı namazı qəza etməkdədir. Bu rükətdə eyni ilə təkbaşına olaraq qıldığı namaz kimi subhənəkə, fatihə və zəmmi surə oxuyar. Bu rükətdən sonra təşəhhüdə oturar. Sonra qalxar Fatiha və zəmmi surə oxuyar, son rükətdə isə sadəcə fatiha surəsini oxuyar. Bu da alimlərdən digər bir qrupun məzhəbidir. İmam Əbu Hənifə də bu rəy üzərinədir. Bu sonuncusu ilə iki rəvayətlə də əməl edilmişdir. Namaz, qiraət baxımından qəza edilmiş, son oturuş (qaderi-axirə) yönündən də tamamlanmışdır.

Burada iki kəlmə arasında ravinin əhəmiyyət vermədiyi bunun kimi fərqlərdən qaynaqlanan hökümlər vardır. Amma ravi fəqih və bu iki kəlmə arasındakı fərqdən qaynaqlanacaq nəticəni bilən olsaydı, hədisin ləfzinə bağlı qalar, məna ilə rəvayət etdiyini və bunun caiz olduğunu düşünərək o kəlməni dəyişdirməzdi.[24] Orada İsmail bin Uleyyə Şubə bin əl Həccacın yalnışını düzəltməkdədir. Şubə hədisdə İsmaildən daha üstün olduğu halda, İsmail fiqh ilə məşğul olduğu üçün Şubənin səhvini düzəltmə haqqına sahib olmuşdur. Şubə İsmayıla: "Fəqihlərin gülü, mühəddislərin əfəndisi" - deyərdi.

24. Xatibin əl Kifəyədə s.168 verdiyi digər misala baxın.

**Dördüncü nöqtə:** Hədisdəki kəlmələrin hərəkə baxımından oxunuşunu təsbit etməkdir. Bunun mənası, Rasulullahın bir kəlməni, mərfu, mənsub, məcrur vb necə oxuduğunun araştırmağın zərurəti deməkdir. Ərəb dilinin incəliyi və bəsit bir nəhv ixtilafının nə kimi əhəmiyyətli bir nəticə doğuracağını hər kəsə məlumdur. Üçüncü nöqtədə zikr edilən hədisdə görüldüyü kimi, bunun zərurəti, ravilər bir kəlməni fərqli şəkillə də rəvayət etdikləri zaman ortaya çıxar. Çünki bir kəlmənin bir tək şəkildə rəvayət edildiyini təsbit etdiyimiz zaman fiqhi ixtilafı ortadan qaldırmış olarıq. Rəvayətlər fərqli olduğu zaman, fiqhi ixtilafların olması da qaçınılmazdır.

Bunu aşağıdaki misal ilə açıqlaya bilərik:

Qəssab bir qoyunu şəri üsula görə boğazladığı zaman heyvanın qarnından ölü bir bala çıxsa, bunu boğazlamadan yemək halalmıdır və ya halal olması üçün boğazlamaq şərtmidir?

Bu məsələdə Rasulullahın - ذكاة إلجنين ذكاة أمه - hədisini görürük. Hədisin ravəyətləri fərqlidir. İbnul Əsir, ən Nihayədə (2/164) belə deyir: “Mərfu və mənsub olaraq rəvayət edilmişdir.” Mərfu olaraq bunu rəvayət edən “zəkətul cənini” mübtədasının xəbəri qəbul etmişdir və belə olduğu halda ananın boğazlanması ilə qarnındakı balanın da boğazlanması deməkdir. Bunun üçün balanın da ayrıca boğazlanması gərəkməz. Mənsub olaraq oxuyana görə təqdir şəklində olar, hərfi cər hazf olunar, məcrur olan kəlmənin hərəkəsi mənsub olar. Və ya təqdir şəklində olar. Məsdər ilə sifəti həzf edilmiş və mudafun ileyh onun yerinə qaim olmuşdur. Bu mənaya görə isə, anasının qarnından ölü çıxdığı zaman boğazlanması şərtdir. Bəziləri də hər iki zəkətə kəlməsini mənsub olaraq ravəyət etmişdir və hədisin mənası cənini anası kimi boğazlayın demək olur. İbnul Əsirin sözü bitdi.

Son iki rəvayətə görə, halal olması üçün cəninin boğazlanması şərtdir. Birinci rəvayətin halal olması üçün cəninin boğazlanması şərtdir. Birinci rəvayətin isə iki mənaya gəlməsi möhtəməldir. Birisi anasının boğazlanması yerinə ceninin yerinə keçəcəyi, digəri də

bəlağətli bir bənzətmə ilə cəninin boğazlanmasının anasının boğazlanması kimi olacağıdır.

İmam əş Şafi və başqaları məşhur olan (zəkat kəlməsinin mərfu oxunduğu) rəvayət ilə əməl etmişlərdir. İmam Əbu Hənifə və başqaları isə son iki rəvayət ilə əməl etmişlərdir. Hər iki tərəfdə görüşünü başqa dəlillərlə də dəstəkləmişlərdir.

Başqa bir misal da verə bilərik: Bu Rasulullahın Saimə olan (xüsusi bir şəkildə bəslənməyib, otlaqda yayılan) qırq dəvənin zəkatı bir bintu ləbundur (iki yaşını doldurmuş dişi dəvədir). Cinsi nə olursa olsun heç bir dəvə hesab xarici tutulmaz. Savabını umaraq zəkatını verən savabı qazanar. Zəkatını verməzsə, həm zəkatını, həm də malının yarısını alarıq. Bu Rəbbimizin haqqıdır Muhammədin ailəsinə bundan heç bir şey yoxdur hədisidir. Bunu Əbu Davud, Nəsai və başqaları rəvayət etmişdir.[25]

Hədisdəki şətra məlihi ifadəsinin necə oxunacağı ixtilaflıdır. Bu, "ş" və "r" hərfinin fəthasıyla, mudaf; ikinci kəlmə mudafun ileyh olaraqmı oxunacaq yoxsa "ş" hərfi mərfu, "t" hərfi şəddəli və "r" hərfi fəthalı olaraq məchul feili mazi şəklində, ikinci kəlmədə naibi fail olaraqmı (yəni şatra məlihi yoxsa şuttıra məluhu şəklindəmi) oxunacaqdır.

Oxunuş şəklinə görə hədisin mənası dəyişməkdədir. Çünki birinci şatra məlihi şəklinə görə mənası zəkatı verməyənə cəza olaraq həm zəkat, həm də malının yarısı alınar. Məşhur olan budur ancaq imamların çoxu bununla əməl etməmişlərdir.[26] İkinci "şuttura məluhu" şəklinə görə mənası "Onun malı ikiyə ayrılar və zəkat toplayıcısına ikisindən birisini tərcih etmə haqqı verilər və o da zəkatı malın yaxşı olan qismindən alar." Bu İmam Əhmədin öndə gələn əshabından İbrahim əl Harbinin tərcih etdiyi görüşdür. İbrahim əl Harbi elm, vəra və zöhddə İmam Əhməd ilə qiyaslanardı. əl Harbi hədisi

25. Avnul Mabud Şərhu Sunəni Əbi Davud, 2/12, ən Nəsai, 5/16

26. "Cumhura görə bu, İslamın başlanğıcında, bu şəkildə mal ilə cəzalandırmanın caiz olduğu zamanda idi. Bu gün isə zəkatdan artığını almaq caiz deyildir. (Haşiyətus Sindi alan-Nəsai, V, 16)"

rəvayət edən ravinin xəta etdiyini söyləmişdir. İmam Əhmədin də buna bənzər bir görüşdə olduğu məzkurdur. Doğrusunu Allah bilər.

İkinci səbəbə keçmədən öncə, çox insanın zehnini məşğul edən iki şübhəyə təmas etmək istəyirəm.

**Birinci şübhə:** İmam Şafi demişdir: “Səhih hədis varsa mənim məzhəbimdir.” Sahiheyndəki hədislər səhihdir və onlarla əməl etdiyimiz zaman, sabit bir sünnə ilə və müsəlmanların mötəbər bir imamının məzhəbi ilə əməl etmiş olarıq. İmam Şafinin məzhəbinin sadəcə məzhəb kitablarında özündən rəvayət edilənlərdən ibarət olduğunu demək elmin məntiqinə yaraşmaz.

**İkinci şübhə:** Allah bizə, Peyğəmbərinə tabe olmaqla qulluq etməyimizi əmr etmişdir. Rasulullahın səhih hədisi varsa, onunla əməl etmək və Rasulullaha tabe olmaq üçün bu kifayətdir. Daha öncə zikr edildiyi üzərə İmam Şafi Humeydiyə sən məni belimdə zünnarla kilisədən çıxarkənmi gördün dediyi kimi, bir müsəlmanın Rasulullahdan səhih olaraq sabit olan bir hədislə əməl etməkdən imtina etməsi caiz deyildir. Allah elmdəki dərəcəsi nə qədər böyük olarsa olsun, məsum olmadığı müddətcə kiməsə tabe olmağı əmr etməmişdir.

**Birinci şübhəyə cavab:** Səhih hədis varsa mənim məzhəbim odur sözünü imam Şafi və başqa imamlar da demişdir. Hətta bu lə iləhə illallah Muhammədur Rasulullah sözünün nə demək olduğunu dərk edən hər müsəlmanın lisanı halı ilə dediyi bir sözdür.

Bu sözlə imamların qəsd etdikləri hədis, əməl edilməyə əlverişli olarsa, mənim məzhəbim odur. Bunun açıqlamasını Hənəfi, Şafi və Maliki məzhəbinə mənsub olan alimlərin açıqlamasına baxaraq deyirəm ki, Onlar qəsd edilənin bu olduğunu və kimin bu şəkildə əmələ əhil olduqlarını açıqlamışlardır.

**Hənəfilərdə:** Kəmal bin əl Huməm, şeyxi Allamə ibnuş Şıhnətil Kəbir əl Hələbi əl Hənəfi, əl Hidəyə üzərinə yazdığı şərhin baş qisimlərində delə demişdir: “Səhih bir hədis mövcud olar və məzhəbin görüşünə tərs olarsa, hədislə əməl edilər və məzhəb də bu olar. Hədislə əməl etməsi Hənəfi məzhəbinə tabe olmuş birini

Hənəfi olmaqdan çıxarmaz. İmam Əbu Hənifənin səhih bir hədis varsa mənim məzhəbim odur dediyi doğrudur. Bunu İbn Abdulbərr Əbu Hənifədən və başqa imamlardan nəql etmişdir. İbnuş Şihnənin sözü bitdi."

Onun bu sözünü İbn Abidin Haşiyəsinin baş qismində nəql etmiş və bu dipnotu əlavə etmişdir: "İmam əş Şarani də bu sözü, dörd məzhəb imamından nəql etmişdir. Bunun nassları, möhkəmini, mənsuxunu incələməyə əhil olan kimsələrə məxsus olduğu aşikardır. Məzhəb alimləri dəlili incələr onunla əməl edərlərsə, bunun məzhəbə izafə edilməsi doğru olar. Çünki məzhəb sahibi buna izin vermişdir. Şübhə yoxdur ki, əgər məzhəb imamı dəlilin zəif olduğunu bilsəydi onu tərk edər və daha qüvvətli olan bu dəlilə tabe olardı."

İbn Abidin mətbu olan Məcmuatur Rəsailindəki Şərhu Rasmil Mufti adlı risaləsinin 24-cü səhifəsində bu sözə təmas etmiş və İbnuş Şıhnənin sözünü nəql edərək, bunun daha öncə haşiyəsindən nəql etdiyimiz üzrə, bir şərtə bağlı olduğunu demiş, sonra bir şərt daha əlavə edərək belə açılamışdır:

"Yenə deyirəm ki, bunun məzhəbdəki, bir görüşə uyğun olması şərti də qoyulmalıdır. Çünki imamlarımızın üzərində ittifaq etdikləri dəlili buraxıb da onların tərk etdikləri hədisi alaraq ictihad etməyə izn verilməmişdir. Çünki imamların ictihadı, o kimsənin ictihadından daha qüvvətlidir. Bəllidir ki, imamlar onun gördüyü dəlildən daha qüvvətli dəlil görmüşlər və bu dəlil ilə əməl etməmişlərdir."[27]

## Diqqətləri iki nöqtəyə çəkmək istəyirəm

**Birincisi:** Pis niyyətli olanlar İbnuş Şıhnənin bu sözünü Hasiyətu ibn Abidindən nəql etmiş və ibn Abidinin buna cavab verməməyini, bunun məzhəb imamlarının və xüsusən məzhəbin muhəqqiq alimlərinin sonuncularından olan ibn Abidinin görüşü olduğuna insanları inandıraraq aldatmağa çalışmışlardır. Necə ki imam Şərani-

27. Sonra ibn Abidin 25-ci səhifədə belə demişdir: "Lakin bəzən imamlarımız, ittifaq etdikləri əsasları, zərurət və başqa səbəblərdən ötrü tərk etmişlərdir. Məsələn, Quran öyrətmə və bənzəri itaətlərdən ücrət almaq məsələsində olduğu kimi.

nin əl Mizanul Kubrasından nəql etdikləri ibarələrində də belə etmişlərdir və onun sözünün arxasına gizlənərək insanlara imam Şərani alim, sufi, mötəbər bir kimsədir sözü dörd məzhəb mənsublarına görə məqbuldur demişlərdir.

Həqiqətən də elədir, lakin onların bu sözü doğru olsa da niyyətləri pisdir, doğru sözə batil bir qəlib uydurmağa çalışmışlardır.

**İkincisi:** İbn Abidinin İbnuş Şıhnənin sözü ilə əlaqəli olaraq dediyi "Bunun nassları, möhkəm və mənsuhunu incələməyə əhil olan birinə məxsus olduğu aşikardır (lə yəxfə ənnə)" sözü çox mühimdir. Çünki "lə yəxfə" demək, bizim bu gün, danışdıqlarımıza "bədəhi" (aşikar) deməmiz kimidir. O bu şərti, bədihi və doğruluğu kər kəs tərəfindən qəbul edilən, qəbul etməkdə tərəddüt və ya ehmal göstərilməsi caiz olmayan xüsuslardan biri olaraq qəbul etmişdir. Məsələn, "Günəş doğur" sözünün, vaxtın gecə deyil gündüzü ifadə etməsi necə bədəhiyyatdansa (aşikardırsa) eyni şəkildə imamın "Səhih hədis varsa mənim məzhəbim odur" sözü də, bədəhi və gerçəkliyi hər kəs tərəfindən qəbul edilmiş olaraq bunun; nassları, nassların nəsx və mənsuxunu və buna bənzər məsələləri incələməyə əhil olan kimsələr üçün olduğunu ifadə edər, yoxsa cahillərin və məğrur elm tələblərinin bu məqamı aşmağa cürət etmələri caiz deyildir.

İnsanları aldadıb, zehinlərini bulandırmaq istəyənlər bu zəruri şərti unutmuşlardır. İnnə lilləhi və innə ileyhi raciun.

İbnuş Şıhnənin sözü ilə İbn Abidinin haşiyəsində, bu sözlə əlaqəli şərtini, Allamə, Mufəssir, Fəqih, Şeyx Abdulğaffar Uyunus Sud əl Hənəfi, "Dəful Əvhəm an Məsələtil Qiraəti Xalfəl İmam" adlı risaləsinin 15-ci səhifəsində nəql etmiş və belə demişdir: "Bu, yerində bir şərtdir. Çünki biz zamanımızda, elm əhli olduğunu zənn edən və aşağıların aşağısında olduğu halda özünü Sureyyadan(Süreyya ulduzu) daha yüksəklərdə görən çox insana rastlamaqdayıq. Bəzən bu kimsələr Kutubu Sittədən birini oxuyar və orada Hənəfi məzhəbinə muxalif bir hədis görər, sonra da Əbu Hənifənin məzhəbini yerə vurun və Rasulullahın hədisi ilə əməl edin deyər. Halbuki bu hədis mənsux ola bilər və ya sənədi daha sağlam olan bir hədisə muxalif

olma və ya başqa əməl edilməsinə əngəl təşkil edən səbəblər ola bilər, o da bunu bilməz. Əgər hədislər ilə əməl edilməsi bu kimilərinə qeydsiz şərtsiz həvalə edilsə, bir çox məsələdə həm özlərini, həmdə onlara sual soruşanları dəlalətə düçar edərdilər."

Sünnə ilə əməl davasında olanlar burada qiyaməti qopardarlar və siz sünnə ilə əməl edən və insanlara hədis ilə fətva verən birisinin dəlalətdə olduğuna necə hökm edə bilərsiz? - deyərlər.

Bizdə deyərik ki: Bəli bu məqama əhil olmadıqca buna hökm edərik. Bu hökmü, bizdən əvvəl, hədis və fiqh imamlarından birisi, yəni İmam Əbu Muhamməd Abdullah bin Vəhb əl Mısri, (Mədinəi Munəvvərədə imam Məlikin, Misirdə əl Leys bin Sadın öndə gələn tələbələrindən idi) hədis alimlər xaric insanların dəlalətə düşməsinə səbəb olar demişdir. Eyni ilə Qadi İyad da, Tərtibul Mədərik 1/96 da eyni sözləri demişdir. İrəlidəki səhifələr və dəvamında Allahın izni ilə daha çox izahat veriləcəkdir.

**Şafilərdə:** İmam ən Nəvəvi, əl Məcmu adlı əsərinin müqəddiməsində (1/104) belə deməkdədir: "İmam Şafinin bu sözü, səhih bir hədis görən "Şafinin məzhəbi budur" - deyib, hədisin zahirinə görə əməl edəcəyi mənasına gəlməz. Bu ancaq, məzhəbdə ictihad mərtəbəsində olanlar üçündür və şərti də imam Şafinin bu hədisi görmədiyi və ya səhih olduğuna qənaət gətirmədiyinə əmin olmaqdır. Bu isə ancaq, İmam Şafinin bütün əsərlərinin və Şafidən elm almış olanların əsərlərinin və bənzərlərinin mütaliəsindən sonra hasil olar. Bu elə çətin bir şərtdir ki, çox az insan yerinə yetirə bilər. Çünki İmam Şafi görüb bildiyi halda, hədisin səhihliyinə tənə edildiyi, mənsux[28] olduğu, təxsis edildiyi, və ya təvil edildiyinə dair bir dəlil olduğu üçün, o hədisin zahiri ilə əməl etməyi tərk etmişdir."

28. Hafız ibn Həcər (773-852), Fəthul Bari, 1/413-də belə deməkdədir: "Necə hədis vardır ki, hədis elmi baxımından səhih olduğu , mənsuxdur." Onun bu sözü Şərhun-Nuhbə bi Hasiyəti Laktid-Dürər,s.41-dəki: "Üləma, səhih olan hər hədislə əməl edilə biləcəyində müttəfiqdirlər." – sözünü açıqlamaqdadır. Sanki o, "Üləma, əməl edilməyə əlverişli bütün hədislərlə əməl edilə biləcəyində müttəfiqdirlər" – demək istəmişdir. Necə ki, bunun belə olduğu, az sonra , ikinci şübhəyə veriləcək cavabda görüləcəkdir.

Şeyx Əbu Amr ibn Saləh belə demişdir: "İmam Şafinin bu sözünün ifadə etdiyi şəkildə əməl etmək asan deyildir. Fəqih olan, özünə görə höccət olan hər hədislə əməl edə bilməz. Şafilərdən bu yolu təqib edənlərdən biri də, imam Şafinin əshabından olan Əbul Vəlid Musa bin Əbil Cəruddur. O, İmam Şafinin bilib başqasının bilmədiyi bir maneədən ötrü səhih olduğunu bildiyi halda bilərək tərk etdiyi bir hədislə əməl etmiş və "Hicama edənin də, qan aldıranın da orucu pozular" demişdir. Əbul Curudun bu sözü rədd edilmişdir. Çünki İmam Şafi səhih olduğunu bildiyi halda, mənsux olduğuna qane olduğu üçün bu hədisi tərk etmiş və mənsux olduğunu açıqlamış, bunun dəlillərini zikr etmişdir".[29] İmam Nəvəvinin sözü və İbni Saləhdən nəqli burada bitdi.

İmam Taqi əs Subku "Məcmuatur Rasailil Müniriyyə" 2/98-114-cü səhifələrdə yer alan "Məna Qavlil İmamil Muttalibi: İzə Sahhal hədisu fəhuvə məzhəbi" adlı risaləsinin baş tərəfində, İmam İbnus Saləhin və bir qismini nəql etdiyim İmam Nəvəvinin sözlərini zikr etmiş və 102-ci səhifədə bu ikisinə muvafəqat edərək belə demişdir: "Bu söz, önünə gələnin aldanıb bu iddiada olması üçün bu mərtəbəyə yüksəlməsinin vacib olduğunu açıqlamaqdadır. (Yəni əhil olmadığı halda bu işə girən məğrur birisidir.)

İki sətir sonra da belə demişdir: "İbn Əbil Cərudun məsələsinə gəlincə, onun sözü, araşdırmadakı qüsuruna görə rədd edilmişdir. İmam Şafinin əslində gözəl olan sözü və bu sözü ilə əməl etməyin imkanı rədd edilməmişdir. Bu məsələdə İbn Əbil Cərud ilə eyni görüşdə olanlardan birisi də Şafi məzhəbinin böyük imamlarından və Said bin əl Asın nəslindən olan Əbul Vəlid ən Neysaburi Hassan bin Muhamməddir. O, bu sözə istinadən İmam Şafinin məzhəbinin, hicama edənin və qan aldıranın orucunun pozulduğuna and içərdi. Daha öncə zikr etdiyimiz kimi, İmam Şafi hədisin səhih olduğunu bildiyi halda mənsux olduğunu deyərək bu hədisi tərk etdiyi üçün Şafilər İbn Əbil Cərudun xəta etdiyini dedikləri kimi, onun da xəta etdiyini demişlərdir. Bu bəzi müctəhidlərin xətaya düçar olduqları

29. Əş-Şafi, İxtilaful-Hədis, (K. əl-Ümm içərisində):VIII, 529 və əl-Məcmu, VI, 402.

bir məsələyə bənzəsə də, bu məsələdə fəhimlər fərqli olduğu üçün xətadan danışmaq çətindir.”

Əbul Həsən Muhamməd bin Abdulməlik əl Kəraci əş Şafinin (fəqih, imam, aqil, alim, şair, ədib və mühəddis idi) fəcr namazında qunutu oxumadığı və məncə Rasulullahın fəcr namazında qunutu tərk etdiyi səhihdir dediyi nəql edilmişdir.

Mən də (yəni əs Subki) fəcr namazında qunutu bir müddət tərk etmişdim. Sonra öyrəndim ki, Rasulullahın fəcr namazında oxuduğu səhih olan qunut, Ril və Zəkvan qəbilələrinə, ayrıca fəcr namazı xaricində də etdiyi bəddua imiş. Fəcr namazında qiyamdan sonra qunut duasını mütləq olaraq tərk etməsinə gəldikdə, bu mövzuda İsa bin Məhanın rəvayət etdiyi bir hədis vardır. İsa haqqında məlum olduğu üzərə tənqidlər çoxdur. Onun haqqında deyilənlərin zikr etməyin yeri burası deyildir. Sonra təkrar qunutu oxumağa başladım. İndi artıq qunutu oxuyuram. Burada İmam Şafinin sözünə muxalif bir şey yoxdur. Bunun səbəbi bizim görüşümüzün qüsurudur. İmam əs Subkinin sözü burada bitdi.

Bu sözlər düşünən birisi üçün nə qədər ibrətlidir! İbn Əbil Cərudun (İmam Şafinin tələbələrindəndi və elmdəki yeri də məlumdur) və onun kimi, bəlkə ondan daha alim olan Əbul Vəlid ən Neysaburinin (İmam Neysaburi sadəcə ravi deyil, həm rəvayət həm də dirayət əhli imamlardandı) halı belə olarsa; bununla birlikdə, and içərək İmam Şafinin mənsux qəbul etdiyi üçün bilərək tərk etdiyi bir hədis ilə əməl edilməsinin İmam Şafinin görüşü olduğunu iddia etdikləri üçün bu alimlərin halı bu olursa, zamanımızdakılara nə demək olar![30]

30. Hafız əz-Zəhəbi (673-748), Təzkiratul-Huffaz, s.627-628-də, Hicri 257-282 il tarxiləri arasında vəfat edən 9–cu təbəqə ricalından bəhs edərkən, ən sonda belə demişdir: “Ey Şeyx, nəfsinə acı və insaf et, bu hədis hafizlərinə pis gözlə baxma, onları qüsurlu görmə və onların zamanımızdakı mühəddislər kimi olduğunu da zənn etmə. Haşa və kəlla, zamanımız mühəddsilərin ən böyükləri içərisində belə, onların elmi səviyyələrinə çata biləcək bir kimsə yoxdur, güman edirəm ki sən, aşırı getdiyin şəxsi görüşlərin səbəbiylə, sözlə olmasa da belə, hal dilinlə: “Əhməd b.Hənbəl də kim? İbnul-Medini də nəyin nəsi? Əbu Zura və Əbu Davud da kimdir ki?” – deyirsən. Ya helm ilə sükut et və ya elm ilə danış. Faydalı elm, bu saydıqların şəxslərdən gələn elmdir, lakin sənin sıqh imamlarına olan nisbətin, zamanımızdakı mühəddislərin hədis imamlarına olan nisbəti kimidir. Nə biz, nə sən; fəzilət sahiblərinin fəzilətini ancaq fəzilət sahibləri bilər.” Bunlar münəqqid Hafiz əz-Zəhəbinin sözləridir. O ki,son dövrlərin böyük mühəddislərindən

İmam Şafinin bir tək fiqhi görüşünü belə anlamaqdan aciz olanların, İmam Şafinin sözü ilə əməl etmələri caizdirmi? (Yəni səhih hədis varsa mənim məzhəbim odur sözü)

Əbul Həsən əl Kəraci (458-532), gördüyün kimi əs Subki (683-756) ona "Fəqih və Mühəddis" dedi, tələbəsi əs Səmani də (467-510) "imam, vəra sahibi, alim, fəqih, müftü, mühəddis, şair, ədib ünvanlarını vermişdir.[31]

Buna baxmayaraq, məzhəb imamına muxalif olaraq hədisin səhih olduğunu və imamının "səhih hədis varsa mənim məzhəbim odur" və "mənim görüşümü tərk edin" sözlərinə dayanaraq qunutu tərk etmişdir. Bununla birlikdə, ondan sonra gələnlər onu tənqid etmişlərdir. əs Subki də bunlardan biridir. Tabaqatuş Şafiiyyə, 6/138,139'da onun tərcümeyi halını verdikdən sonra, məzkur görüşünə təmas edərək belə demişdir: "Onun önündə, anlaşılması son dərəcə çətin olan iki maneə vardır. Qunutun nəhy edilməsi ilə əlaqəli hədisin səhih olmasına gəlincə, heyhat, bunu təsbit edə bilməsi çox çətindir. Qunutun tərk edilməsi İmam Şafinin məzhəbi olduğunu qəbul etməsi də eyni şəkildə çətindir."

İmam Taqi əs Subki (683-756) də, üzərində yetişdiyi Şafi məzhəbinə tabe olaraq sabah namazlarında qunutu oxuyurdu. Sonra əl Kəracinin bu məsələsinə muttali olanda qunutu tərk etmişdir. Daha sonra yenidən qunuta qayıtdığını görürük. İmam Subki haqlı olaraq "Müctəhidi mütləq" və " Müctəhid fil Məzhəb" olaraq vəsifləndirilmişdir.

Onun müasiri Hafız əz-Zəhəbi onun, hədis və fiqh elmində əsrinin şeyxi olduğunu demişdir. İmam Subki Şamda Əməvi məscidinin xətibliyinə təyin ediləndə onun haqqında: "Hakim, Bəhr, Taqi, əsrin

---

bir çoxunun yaşadığı H.8 əsrdə yaşamaışdır. Bu əsrin başında, İmam İbn Dakikil-İyd (v.702), sonunda da Hafiz İbn Rəcəb əl-Hənbəli (v.795) var idi. Allah hamısına rəhmət etsin, bunlara bax da ibrət al, həqiqəti gör. Bu imamlardan birinin, elmin tamamını əhatə etdiyini iddia etməsi bir yana, öz şəxsi üçün elm iddiasında olduqlarını belə görmədik. Bununla birlikdə onlar,sünnəyə vaqif və ləfizlərinə, isnadlarına və mənalarına vaqif olma xüsusunda həris idilər. Ali b.əl-Mədini (161-234) belə demişdir:"Hədisini mənalarını anlamağa çalışmaq elmin yarısı, rical elmi də digər yarısıdır."

31. ət Taqi əs Subki, Tabaqatuş Şafiiyyətil Kubra, 6/138

bütün şeyxlərinin ən hafizi, ən müttəqisi, onların ən böyük qazisi Əli[32] üzərinə çıxdığında, Əməvi məscidinin minbəri ona mühəyya (hazırlanmış) olsun!” – beytini söyləmişdir

Bu dərəcə elm sahibi olduğu halda, İmam Subki belə tərəddüddə qalırsa, ondan daha aşağı dərəcədə olan birinin imam Şafinin sözünün zahirinə tutunub həm özünün, həm də başqalarının başını qarışdıraraq, müsəlmanların bizcə də qəbul edilən mötəbər və mötəməd imamlarından birinin sözü ilə əməl etdiyini iddia edərək səhih olan hər hədislə əməl etməyə çalışması caiz olar mı?

Başqalarının başına gələnlərdən ibrət alaraq kiçikliyimizdən bəri, Allahın tabe olmağı nəsib etdiyi bir imamın görüşlərinə tabe olmağımız gərəkməz mi?

Sonra əs Subki, məzkur risaləsinin 106-cı səhifəsində, Əbu Şamə əl Məqdisiyə aid və içərisində mövzumuzla əlaqəli qisimlər olan uzun bir mətn nəql edər və bu mətnin başında imam Subki “İbnus Saləhin tələbəsi və İmam Nəvəvinin şeyxi Əbu Şamə hədisə ittiba xüsusunda mübalağa göstərənlərdəndir” - deyərək daha sonra onun sözünü  nəql edər. Bunun sonunda Əbu Şamə belə deməkdədir: “Buna ancaq ictihadı məlum olan bir alim cürət edə bilər ki, İmam Şafinin mənim görüşümə muxalif  bir hədis gördüyünüz zaman, hədislə əməl edin, mənim görüşümü tərk edin sözü ilə qəsd etdiyi belə bir kimsədir, yoxsa hər kəs bu işə qalxışacaq demək deyildir.”

Mühəddis, fəqih , təqva sahibi imamlardan nəql etdiyimiz bu son dərəcə mühim açıqlamalar nəticəsində, imam Şafinin bu sözü ilə kimi qəsd etdiyini və onun, əslində belə olmadıqları halda, elmə və alimlərə qarşı böyüklük göstərənlərin qəsd edilmədiyi anlaşılmış olmaqdadır.

Maliki alimlərinə gəlincə: İmam Subki 108-ci səhifədə əl Furuq, əl İhkəm, vb. əsərlərin müəllifi, imam, höccə, üsulçu Şihabuddin Əbul Abbas əl Qarrafi əl Malikinin “ət Tənqih” və onun şərhindən, bu mərtəbəyə əhil olan birinin halını açıqlayıcı bir nəql etmiş və belə

32. ət Taqi əs Subkinin adı Əlidir. Tam adı da Əli b. Abdilkafi əs-Subkidir.

demişdir: "Şafi fəqihlərinin bir çoxu buna istinadən Şafinin məzhəbi budur, çünki bu mövzuda səhih bir hədis vardır deyirlər, bu xətadır. Çünki bu söz o hədisə muarid başqa bir hədisin mövcud olmadığını haqlı olaraq ortaya qoya biləcək şəkildə, şəriətin tamamını bilmə əhliyyətinə sahib kimsələrə məxsusdur. Mütləq müctəhid olanın, şəriətin tamamını bilmə əhliyyətinə sahib kimsələrə məxsusdur. Mütləq müctəhid olmayanın, şəriətin tamamını əhatə etdiyini söyləməsinə isə etibar edilməz. Şafilərdən bu görüşdə olanların, belə bir fətvanı vermədən öncə, şəriətin tamamını əhatə etmə əhliyyətinə haiz olması lazımdır.

Yəni: Bir məsələdə səhih bir hədis var deyə, o hədisin hökmünü Şafi məzhəbinə izafə etmək istərsək, onu ancaq mükəmməl bir araşdırmadan sonra izafə edə bilərik. Ta ki o hədisə müxalif başqa bir dəlil olmadığını yəqinliklə bilək. O hədisə qarşı başqa bir dəlil olmadığını bilmək isə, sadəcə hədislərə deyil, şəriətin tamamına vaqif olma əhliyyətinə sahib kimsələrə məxsusdur. Bu bilgini isə müctəhiddən başqası əldə edə bilməz.

Birinci şübhə ilə əlaqəli olaraq İbn Abidin, İbnus Saləh və tələbəsi Əbu Şamə, Əbu Şamənin tələbəsi İmam Nəvəvi, əl Qarrafi və əs Subki kimi imamlardan nəql etdiyimiz bu cavabın xülasəsi budur: "Məzkur sözünə dayanaraq İmam Şafi və ya başqa bir imamın məzhəbinə hər hansı bir hökmü izafə etmə iddiasında ola biləcək bir dərəcəyə, ancaq ictihad və ya ona yaxın bir mərtəbədə olan kimsələr çata bilər."

**Beləliklə anlaşıldı ki;** Bizim kimilərin, səhih hədis belə olsa, mücərrəd hər hansı bir hədisə vaqif olmasına dayanaraq, bunun İmam Şafinin məzhəbi olduğunu və o hədislə əməl edincə, mötəməd bir imamın mötəbər bir fiqh məzhəbiylə əməl etmiş olacağını iddia etməsi doğru deyildir.

**Yenə anlaşıldı ki;** Keçmiş alimlərin böyüklərindən bir qrup, bu sözün zahiri ilə əməl etmiş fəqət onlardan sonra gələn alimlər, onların xətalı olduqlarını demişlərdir və onlar bunu tətbiq edib etməmədə tərəddüd etmişlərdir. Ağıllı birinə yaraşan, ibrət almaqdır!

Bununla bərabər imamın bu sözünün xəyali bir nəzəriyyə olmayıb, bu sözdə bir həqiqət payı olduğunu da inkar etmirik, ancaq hər işin əhli vardır və insanın həddini aşmaması lazımdır.

**İkinci şübhənin cavabına gəlincə, deyərik ki;** Bu şübhə iki əsasa dayanmaqdadır.

**Birincisi:** Hədisin səhih olması, onunla əməl edə bilmək üçün kifayətdir.

**İkincisi:** Biz insanlardan filan və ya falana tabe olmaqla deyil, Allah Rəsuluna tabe olmaqla əmr olunmuşuq.

Birincinin cavabı səhih hədis varsa mənim məzhəbim odur sözü ilə əlaqəli birinci şübhənin cavabında mövcuddur. Eyni şəkildə burada da deyirik ki: hədisin səhih olması, onunla əməl edə bilmək üçün kifayətdir sözünün mənası, hədisin əməl edilməyə əlverişli olması üçün kafidir deməkdir. Hədisin əməl edilməyə əlverişli olması isə ancaq, onun mətin və sənədi ilə əlaqəli bir çox şərtinin uyğun olmasından sonra mümkündür. Bu şərtlərin bir qismi hədis elmi ilə əlaqəlidir, bir qismi isə usul elmi ilə əlaqəlidir. Hədisin sənədindəki ravilərin tədqiqi bəzilərinin zənn etdiyi kimi, elə "Təqribut Təhzib"ə [33] baxmaqla həll edilə biləcək bir iş deyildir. Bu ancaq, hədis və hədis elmləri ilə, usul və füruda dərin bilgisi olan imamların edə biləcəyi böyük bir işdir.

Bu səhv anlama səbəbi ilə, fiqhdən öncə, ihya etmək istədikləri sünnəni yerlə bir etmiş olurlar. Eyni ilə bu anlayış insanları yanlış yola sövq etməkdədir.

İmam, Hafız ibn Abdulbərr (368-463) Cəmiu Bəyənil ilm, 2/130-cu səhifədə sənədi ilə Qazi, Müctəhid ibn Əbi Leylədən (v.148) belə rəvayət etmişdir: "Bir kimsə (hədislərin) bir qismini alıb, digərlərini tərk etmə əhliyətinə sahib olmadıqca, hədis fiqhinə sahib ola bilməz."

İmam, Hafiz ibn Hibban (v.354) da əl Məcruhin adlı əsərinin müqəddiməsində 1/42 İmam Abdullah bin Vəhbdən (v.197) sənədi

33. İbni Həcər əl-Əsqalaninin hədis elminə dair ravilər haqqında yazdığı kitabdır.

ilə belə nəql edər: “Üçüz altmış alim ilə görüşdüm, Malik (95-179) ilə Leys (94-175) olmasa elmdə yolumdan sapardım.”

Sonra yenə ondan belə rəvayət etmişdir: “Elmdə dörd kişiyə tabe olduq: İkisi Misirdə, ikisi Mədinədə. Leys bin Sad və Amr bin əl Haris (91-147) Misirdə, Malik və əl Mədşun (v.164) Mədinədə. Bunlar olmasa idi biz dəlalətə düşərdik.”

Hafiz bin Abdulbərr də əl İntiqasında (səhifə 27-28) ondan, bunun kimi bir söz daha nəql edər. Allamə Kövsəri də Allahın yardımı olmasa idi, onun dəlalətə necə düçar olacağının səbəbini açıqlayan başqa bir rəvayət nəql etmiş və belə demişdir: “İbn Asakirin sənədi ilə İbn Vəhbdən rəvayətində isə belədir: Malik bin Ənəs və Leys bin Sad olmasaydı mütləq həlak olardım. Mən Rasulullahın hər hədisi ilə əməl edilər zənn edərdim. Başqa bir rəvayətdə yolumu sapardım demişdir.”

İmam Kövsəri belə demişdir: “Fiqhdən uzaq, əməl edilməyə əlverişli olanla olmayanı ayırd edə bilməyən ravilərin çoxu bu haldadır.” Kövsərinin nəqli və dipnotu bitdi.

Qadi İyadin Tərtibul-Mədərik, 2/427-dəki rəvayəti isə belədir: “İbn Vəhb (v.97) “Allah məni Malik (95-179) və əl-Leys (95-175) sayəsində qurtarmasaydı, mən yolumu azardım.” – demişdir. Ona, “Bu necə olur” – deyildi, cavabında: “Bir çox hədis topladım və hansıyla əməl edəcəyimi bilmədim. Onları Malikə və əl-Leysə ərz etdim, onlar da mənə “Bunu al, bunu burax.” – deyirlərdi.”

İbn Vəhb: “Hədis, alimlər xaric insanların dəlalətə düşmələrinə səbəb olar.” – sözünü bunun üçün söyləmişdir. Yenə eyni səbəblə İmam Malik, bacısının oğulları olan Əbu Bəkr b. əbi Üveys (v.202) və İsmayıl b. əbi Üveysə (v.226) bu cür nəsihət etmişdir: “Görürəm ki, bu elmi – hədis toplayıb, rəvayətləri eşitməyi – sevir və tələb edirsiniz.” Onlar, “Bəli” – dedilər. İmam Malik də: “Əgər hədisdən istifadə edib, Allahın sizinlə başqalarını da faydalandırmasını istəyirsinizsə, hədisləri azaldıb, onların fiqhini öyrənməyə çalışın.” – dedi. Əl-Xatib, əl-Fəqih vəl-Mütəfəqqih, II, səh. 28-də bunu sənədiylə rəvayət etmişdir.

Yenə sənədiylə, İmam əl-Buxarinin (194-256) məhşur müəllimlərindən olan Əbu Nuaym əl-Fadl b. Dukeynin (v.218) belə dediyi rəvayət edilmişdir: "Əbu Hənifənin (80-150) öndə gələn tələbələrindən Züfər b. əl-Hüzeylə (110-158) baş çəkdim, o -əlbisəsinə bürünmüş bir halda- "Sən ağıllı bir adamsan, gəl hədislərini ələkdən keçirim." – deyirdi, mən də eşitdiyim hədisləri ona göstərirdim, o da "Bununla əməl edilər, bununla  edilməz; bu nəsxdir, bu da mənsuxdur." – deyirdi.

Bu səbəblə İmam Malik (95-179), özündən hədis aldığı şəxsləri seçərdi. Seçim edərkən ravinin siqa və məqbul olmasına baxardı. O, rəvayət etdiyi hədisi anlayan dirayət əhlindən ala bilmək üçün, onlar arasında seçim edərdi.

Qadı İyad, Tərtibul Mədərik 1/124,125 - də belə demişdir: "İbn Vəhb deyir ki: Malik, əl Allaf bin Xalidə (rəvayəti məqbul olanlardan idi) baxdı və: "Eşitdiyimə görə siz bu adamdan hədis götürürsünüz" - dedi. Mən də: "Bəli, götürürük" - dedim. Malik: "Biz ancaq fəqih olanlardan hədis götürürük" - dedi."

Malik bu xüsusda müəllimi İmam Rabiatur Rəyə (v.136) tabe olmuşdur. Xatib, əl Kifayə, s.169-da Malikdən, Rabianın ibn Şihab əz Zuhriyə (50-124) belə dediyini nəql edər: "Madəm ki, sən Rasulullahın hədislərini rəvayət edirsən, o halda hədislərin mənalarını anlamağa çalış!"

Malik və Rabiadan öncə, Küfənin imamı və fəqihi İbrahim ən Nəxai (v.95) eyni şeyləri demişdir. Yenə əl Xatib ondan bu rəvayəti nəql edər: "Muğira əd Dabbi (v.136) İbrahimin məclisinə gec gəlir. İbrahim ona deyir: "Ey Muğira, niyə gecikdin?" Muğira deyir: "Bir şeyx (yəni ravilərdən biri) gəldi, biz də ondan hədis yazdıq." İbrahim ən Nəxai deyir: "Görürsənki biz hədisləri ancaq halal və haramı bir-birindən ayıra bilən kimsələrdən götürürük. Görərsən ravi hədisi rəvayət edərkən, fərqində olmadan halal ilə haramı bir-birinə qarışdırar."

Əl Xatib, əl Fəqih vəl Mutəfəqqih, 2-ci cild, səhifə 15-19-da, İmam Şafinin (150-204) elminin varisi imam əl Muzənidən (v.264)

uzun bir nəql rəvayət edir və sonunda imam Muzəni deyir: "Allah sizə rəhmət etsin, topladığınız hədislərə yaxşı baxın və elmi fiqh əhlindən axtarın ki, fəqih olasınız."

Bunlar, hədislərlə əlaqəli araşdırma aparmaqla yanaşı, fəqih imamlara baş vurmağın zərurəti ilə əlaqəli şeylərdir. Onların iddia etdikləri kimi hədisin səhih olması, onunla əməl etməyin vacib olması üçün yetərli deyildir.

Burada, bu iddia ilə əlaqəli olaraq, onun əsilsizliyin və dəyəri olmadığının ortaya çıxması üçün, açıqlanması zəruri olan başqa bir xüsus vardır.

Səhabənin və onlardan sonra gələn sələfimizin keçmişi göstərməkdədir ki, onlar bir hədisi qəbul edib, onunla əməl edə bilmək üçün, hədislərin rəvayətiylə kifayətlənmir, bununla yanaşı o hədislərlə əməl edilib-edilməyəcəyini də araşdırırdılar.

İmam Kövsərinin, "Necə ki fiqhdən uzaq, əməl edilməyə əlverişli olanla-olmayanı ayırd edə bilməyən ravilərin çoxu bu haldadır." - dediyi daha öncə zikr edilmişdi.

İndi də Tərtibul Mədərikdən (1,61) uzun bir rəvayət nəql edəcəm. Burada sələfin bəzilərinin əməl etməsinə baxaraq, hər kəsin əməl etdiyi və ya heç kimin əməl etmədiyi üçün, siqa ravilər tərəfindən rəvayət edilmiş olsa belə, əməl etməyi tərk etdikləri hədislər qarşısındakı halı açıqlanmaqdadır.

Qadi İyad belə deməkdədir: "Mədinə əhlinin əməlinə (tətbiqinə) müraciət etməyin vacib olması və rəvayətlərə müxalif olsa belə, onlara görə bu tətbiqatın (əməlin) höccət olması ilə əlaqəli bab: Ömər bin Xattabın minbərdə belə dediyi rəvayət edilmişdir: "Billahi, əməl edilənin xilafına rəvayət edən kəsin məndən çəkəcəyi var."

İbn əl Qasim (v.191) və İbn Vəhb (v.197) belə demişlərdir: "Malikin nəzərində, əməlin (mədinəlilərin tətbiqinin) hədisdən daha üstün olduğunu gördüm."

Malik (95-179) belə demişdir: “Tabiindən elm əhli olanlara hədislər rəvayət edilərkən, bunlar da o insanlara deyərdilər: Biz bunu bilirik amma əməl bu şəkildə gəlməmişdir.”

Malik belə demişdir: “Muhamməd bin Əbi Bəkr bin Amr bin Həzmi gördüm, qadı idi. Qardaşı Abdullah çox hədis rəvayət edən sadiq birisi idi. Eşitdim ki, Muhamməd bin Əbi Bəkr hökm verdiyi zaman, qardaşı Abdullah o hökmə muxalif bir hədis rəvayət edər və qardaşını danlayaraq ona: “Bu mövzuda bu hədis yoxdurmu?” - deyər, qardaşı da: “Bəli, var” - deyərdi. Bunun üzərinə digəri, “Niyə hədisə görə hökm vermirsən” - deyər, digəri də, “Sən, əsl Mədinə alimlərinin ittifaq etdiyi hökmlərə bax” - deyərdi. Bununla mədinə əhlinin tətbiqatının hədislərdən üstün olduğunu qəsd edərdi.

İbn əl Muazzəl (v.240) belə demişdir: “Birinin ibn əl Məcişuna (v.213): “Niyə hədisi rəvayət etdiyiniz halda onunla əməl etməyi tərk etdirsiniz?” - sualını soruşduğunu eşitdim. O da, “bir bildiyimiz var ki, ona dayanaraq tərk etdiyimiz bilinsin” - deyə cavabını verdi.

İbn Mehdi (v.195) belə demişdir: “Mədinə əhlinin keçmiş tətbiqatı hədisdən üstündür.”

Rabia (v.136) belə demişdir: “Bir nəfərin min nəfərdən rəvayətini, bir nəfərin bir nəfərdən rəvayətinə tərcih edərəm. Çünki, bir nəfərin bir nəfərdən rəvayəti sünnəni əlinizdən almaqdadır.”

İbn Əbi Həzim (v.184) belə demişdir: “Əbud-Dərdadan sual soruşarlar, o da cavab verərdi. Onun cavabına muxalif olaraq, “biz belə bir hədis eşitdik” - deyərlərdi. O da, o hədisi mən də eşitdim, lakin mənim gördüyüm və əməl edilən tətbiqat, başqa şəkildədir” - deyərdi.

İbn Əbiz Zinad (100-174) belə demişdir: “Ömər bin Abdulaziz (v.101) fəqihləri toplayar və mədinədə tətbiq edilən sünnələri və hökmləri soruşar, sonra onları yazdırardı. Mədinədə tətbiq edilməyən hədisləri isə, qaynağı siqa belə olsa, ilğa edərdi (yazdırmazdı).” Qadı İyaddan nəql edilən sona çatdı.

Alimə yaraşan, hədis və fiqhin hər ikisinə müraciət etmək və elmi zehniyyət olaraq, hər birini sərhədlər içərisində muhafizə etməkdir.

Qadı İyad, Tərtibul Mədərik 2/541-də Muvattanı İmam Malikdən rəvayət edən Əndulusun parlaq zəkası[34] İmam Yahya bin Yahya əl Leysinin (v.234) biyoqrafiyası əsnasında bunları nəql edər: Yahya belə demişdir: "Abdurrahman bin Qasımın (v.191) yanına gedərdim, o mənə haradan gəlirsən, ey Muhamməd? - deyə soruşar, mən də Abdullah bin Vəhbin yanından gəlirəm" - deyərdim. O da: "Allahdan qorx, çünki əməl (yəni mədinə alimlərinin ittifaq etdikləri hökmlər) bu hədislərin çoxuna muxalifdir" - deyərdi.[35]

Sonra Yahya belə deyər: "Allah ikisinə də rəhmət etsin, ikisi də doğru söylədilər. İbnul Qasım məni, Mədinə əhlinin əməlinə uymayan hədislərlə əməl etməkdən nəhy etdi, dediyi doğrudur. İbn Vəhb də məni rəy külfətindən və rəyi çoxaltmaqdan nəhy edib, hədislərə tabe olmağı əmr etdi, onun da dediyi doğrudur. Sonra Yahya belə dəvam edər: "İbn əl Qasımın rəyinə tabe olmaq rüşddür, İbn Vəhbin rəvayət etdiyi hədislərə tabe olmaq hidayətdir."

Hafız ibn Rəcəb əl Hənbəli (v.795) də "Fədlu ilmus sələf aləl xələf" adlı qiymətli risaləsinin 9-cu səhifəsində belə demişdir: "İmamlara və hədisçilərin fəqihlərinə gəlincə, onlar səhih hədis ilə ancaq, o hədis ilə sahəbə və ondan sonrakılar və ya onlardan bir qismi tərəfindən əməl edildiyi təqdirdə əməl edərlərdi. Amma onlarla tərk edilməsində ittifaq edilən hədislərlə əməl etmək caiz deyildir. Çünki onlar hədisi onunla əməl etməməyi gərəkdirən bir bilgiyə sahib olduqları üçün tərk etmişlərdir. Ömər bin Abdulaziz (v.101) belə

---

34. "Aqilul-Əndəlüs". Tərtibul-Mədərik, II, səh.537-də belə deyilməkdədir:Yəhyanın davranışları və zəkası Malikin xoşuna gələrdi. Rəvayət olunur ki, bir gün o, Malikin bütün əshabı ilə bərabər oturarkən, o sırada birsi "Fil gəlmiş!" – dedi və Malikin bütün əshabı fili görmək üçün bayıra çıxdılar. Malik (bayıra çıxmayan Yəhyaya): "Əndəlüsdə fil tapılmaz, sən niyə fili görməyə getmirsən?" – deyər, Yəhya da: "Vətənimdən buraya sadəcə səni görməyə və elmindən və əxlaqından bir şeylər öyrənmək üçün gəldim, fil görməyə deyil!" – cavabını verir. Malik onu təqdir edər və ona əl- Aqil (ağıllı, zəkalı) ləqəbini verir"

35. Buraya qədər olan qismi İbn Abdilbərr, sənədiylə Camiu Bəyanil-Elm, II, səh.159-da rəvayət etmişdir.

demişdir: “Sizdən əvvəlkilərə müvafiq olan ictihadlara tabe olun. Çünki onlar sizdən daha alim idilər.”

Sonra 13-cü səhifədə belə demişdir: “İnsan onlardan (Məzhəb imamları) və digərlərindən sonra ortaya çıxan şeylərdən çəkinməlidir. Çünki onlardan sonra yeni çox şey ortaya çıxdı. Zahirilər və bənzərləri kimi, hədis və sünnəyə tabe olma iddiasında olanlar ortaya çıxdı. Halbuki onlar, fərqli anlayışları səbəbi ilə imamlardan ayrıldıqları və özlərindən əvvəlki imamların əməl etmədikləri ilə əməl etdikləri üçün, sünnəyə son dərəcə muxalifdirlər.”

İlamul Muvaqqiin 1/44 -də İmam Əhmədin belə dediyini nəql edər: “Bir nəfərin əlində, içərisində Rasulullahın hədisləri ilə, sahabə və tabein ixtilafları olan bir kitab olduğu halda, elm əhlinə bunlardan hansının qəbul ediləcəyini soruşub, səhih bir hökmlə əməl etmiş olmadıqca, o insanın istəyi ilə əməl etməsi, dilədiyini tərcih edib onunla hökm verməsi və əməl etməsi caiz deyildir.”

İmamın bunlardan hansının qəbul ediləcəyini elm əhlinə soruşmadıqca sözünə diqqət et. Bu söz buna işarət etməkdədir. Bir kimsə səhih bir hədis görər və səhih olmasına baxaraq hədisin səhih olmasının, onunla əməl edə bilmək üçün kifayət olduğunu zənn edərək onunla fətva verər. Lakin İmam Əhməd belə tələsik fətva verməyin caiz olmadığına və üstəlik fiqh və mərifət əhli alimlərə, bu hədislə əməl edib edilə bilməyəcəyinin soruşulmasının şərt olduğuna işarə etməkdədir. Onlar bu hədisin əməl etməyə əlverişli olub olmadığını ona deyərlər.

İmam, müctəhid Sufyan əs Sövri (97-161) də belə demişdir: “Elə hədislər vardır ki, onlarla əməl edilməz.” Hafız ibn Rəcəb bu sözü “Şərhu iləlit Tirmizi” səhifə 29-da nəql etmişdir. Daha öncəki səhifələrdə ibn Əbi Leylanın (v.148): “Bir kimsə, (hədislərin) bir qismini alıb digərlərini tərk etmədikcə (əhliyyətinə sahib olmadıqca) hədis fiqhinə sahib ola bilməz” - dediyini zikr etmişdik.

**İkinci nöqtənin; “Müsəlman, başqasına deyil Rasulullaha tabe olmaqla əmr olunmuşdur” cümləsinin cavabına gəldikdə, bu sözü söyləyənə deyərik ki:** Sənin, “sünnəyə sa-

rılmağa təşviq edən və sünnənin elmən və əmələn tərkinin doğru yoldan uzaqlaşma, xüsran və dəlalət olduğunu deyən islamın imamlarının görüşlərindən bir nəbzə bəhs edilmişdi...” sözün, o məzhəb imamlarının hidayət üzərə olmadıqlarını və Rasulullaha ittiba etməmiş olmadıqlarını gərəkdirər. Bu səbəblə sən Rasulullaha tabe olmaq üçün onların xaricində bir yol axtarırsan deməkdir. Sən onların sanki Allahın kitabı və Rəsulunun sünnəsindən bir dəlilə dayanmaqsızın, insanlar üçün halal və haram mövzusunda hökmü özləri verən ruhbanlar şəklində təsəvvür edirsən. Halbuki onlar, onları sevən birisinin təsəvvür etdiyindən daha çox sünnəyə bağlı idilər və onlar özlərindən sonra gələnlərə sadəcə, müəzzinin imamın təkbirlərini arxa saflara çatdırması kimi, Rəsulullahın əmrlərini çatdırırlardı.

**Əgər desən ki:** Mən dinimin hökmlərini dəlilləri ilə anlamaq istəyirəm. Bu hökmü, Əbu Hənifənin dediyi şəkildə anlaya bilmədim, amma İmam Şafinin dediyi şəkildə anlayıram. Dəlilini anlamadığım zaman hər hansı bir əməli şövqlə edə bilmirəm. Bu səbəblə, bu məsələdə İmam Şafinin məzhəbinə görə əməl edəcəyəm, bunda bir problem varmı?

**Cavab budur:** Bu, bir məzhəbdən digərinə keçməkdir.

- Ya müqəllidin, möhtac olduğu bir məsələdə o məzhəbi təqlid etməsindən iləri gəlir ki, bunda bir problem yoxdur, caizdir.

- Ya məzhəblərin asan tərəflərini araşdırmağa dayanır ki, bu caiz deyildir və mövzumuzun xaricindədir.

- Ya da bir məsələdə araşdırma və ictihad nəticəsi ortaya çıxar.

## Bu təqdirdə baxılar:

Əgər araşdırıcı bu məqama (müctəhidlərin dəlilləri arasında tərcih edə bilmə məqamına) əhil isə və tərəfsizsə, bunda bir bəis yoxdur.

Yox əgər əhil deyil isə, araşdırmasında tərəfsiz də deyil isə (hansı ki, sələfə müntəsib olduqları iddiası ilə imamlara hörmətdə qüsur

edən və onlara qarşı alimlik edənlərin halı da belədir və onların halı üsyan, pozğunçuluq, münaqişə və mücadələdən başqa bir şey deyildir) bizim rədd etdiyimiz və hansı ləqəb və nisbət arxasına gizlənərsə gizlənsin, kimsəni təsdiq etmədiyimiz xüsus da budur.

Bu yalnış fikirlərə aldanmış olanlara deyərik: Bir məsələdə Hənəfi məzhəbindən Şafi məzhəbinə keçmək, başqa bir məsələdə isə Maliki məzhəbinə, digər məsələdə Hənbəli məzhəbinə keçməyə qədər gedər. Bu silsilə dördüncü bir məsələdə ya ilk məzhəbə və ya dörd məzhəb xaricində, elmi yöndən ardıcılları olmayan digər məzhəblərə qədər gedər.

Əd-Dariminin Sünənində (1/91) xəlifə Ömər bin Abdulazizin (v.101): “Kim dinini münaqişələrə hədəf edərsə, çox tez tez görüş dəyişdirər” sözü ilə qəsd etdiyi də budur. Sonra, birdən çox məzhəblə əməl edən bu kimsənin aqibəti, onun dörd məzhəb xaricinə, sonra da qırx məzhəb xaricinə çıxmasına qədər gedər.

Başından keçən bir hadisədə İmam Malik, Ömər bin Abdulazizin bu sözünü dəlil olaraq istifadə etmişdir. Burada bizimdə zikr etdiyimiz münasibdir. Bunu İbn Abdulbərrin “əl İntiqa”-sından (s.33) İmam Malikin əshabından Maan bin İsaya (v.198) qədər uzanan bir isnad ilə zikr edirəm:

“Maan bin İsa deyir: “Bir gün Malik məsciddən qayıdırdı. Əlimi tutmuş bir halda ikən Əbul Cuveyriyyə deyilən bir adam (Murciyədən[36] olmaqla ittiham edilirdi) ona çatdı və: “Ey Əbu Abdullah, məni dinlə, sənə dəlil gətirib görüşümü açıqlayacağam, bir şey söyləyəcəm” - dedi. Malik: “Bəs məni məğlub etsən necə?” O: “Mənim görüşümü qəbul edərsən” - dedi. Malik dedi: “Bəs mən səni məğlub etsəm necə?” O: “O zaman mən sənin görüşünü qəbul edərəm” - dedi. Malik dedi: “Əgər birisi gəlsə və ikimizi də məğlub etsə necə?” O, “o zaman onun görüşünü qəbul edərik” - dedi. İmam Məlik: “Allah Muhammədi tək bir din ilə göndərmişdir. Görürəm ki, sən budaqdan budağa tullanırsan. Ömər bin Abdulaziz : “Kim dinini mü-

36. Bidətçi sayılan etiqadi firqələrdəndir. Murciyə məzhəbinin ən əsas fərqləndirici görüşü: “İman edən birisinə günah işləməsinin zərər verə bilməyəcəyi kimi, küfür işləyənə də savab əməllərinin bir faydası olmaz.”

naqişələrə hədəf edərsə tez-tez görüş dəyişdirər" - demişdir cavabını verdi."

İmamların yolundan başqa bir yolla dəlilə tabe olduğunu iddia edən bu kimsə, fərqində olmadan və hətta sünnəni nəşr və ona dəvət etdiyini iddia edərək heç bir imamın söyləmədiyi görüşləri ortaya qoyur.

Bu fikir, daha başqa təhlükələrə açılan bir dəhlizdir. İmam Malik bu təhlükəyə ən gözəl şəkildə diqqət çəkmiş və belə demişdir: "İmamlara tabe olun və onlarla mücadələ etməyin. Əgər cədəldə başqalarından üstün gördüyümüz hər adama tabe olacaq olsaydıq, Cəbrayılın gətirdiklərini rədd etmə halında qalacağımızdan qorxulardı."[37]

Üstəlik sənin, Əbu Hənifənin görüşünün dəlilini anlamadığın halda, İmam Şafinin dəlilini anladığını iddia etməyin, daha öncə zikr etdiyimiz alimlərin etdiklərinə bənzəməkdədir. O alimlər bir məsələdə imam Şafinin görüşünə muxalif səhih bir hədis olduğunu iddia etmişlər və məzhəblərindəki hökmü buraxıb, səhih olduğunu qəbul etdikləri hədislərlə əməl etmişlərdir. Sənin bu etdiyin, onların bu halına bənzəməkdədir, hətta eyni şeydir. Bunun aqibətini görmüşdün. Fəqihlərə tabe olmaq dinin salamatıdır deyən Süfyan bin Uyeynədən Allah razı olsun.

Oxuyucu üç imamın - İmam Malik (95-179), İbn Uyeynə (v.198) və İbn Vəhbin (v.197) ) fəqih imamlara tabe olunması və tabe olunmadığı təqdirdə insanın dini baxımdan təhlükədə olduğu xüsusundakı sözlərinin bir-birinə müvafiq olduğuna diqqət etsin.

Bunlar "Fəqihlərin ixtilaf səbəblərinin" hədislərə aid birinci səbəbi ilə əlaqəli xüsuslardır.

Bundan sonra ikinci səbəbə keçirəm.

37. əş Şərani əl Mianul Kubra, 1/51

# II Səbəb

## Hədisləri Fərqli Şəkildə Anlamalarından Doğan İxtilafların Açıqlanması

İmamların hədisləri fərqli şəkildə anlamaqları iki səbəbdən dolayı ortaya çıxmaqdadır.

1 – Anlayışlarının və əqli mələkələrinin fəqli olması.

2 – Hədisin ləfzinin birdən çox mənaya gəlməsinin mümkün olması.

**Birinci Xüsus:** Ağıl sahibi olan heç kəs bundan şübhə etməz. Çünki insanlar; ağıl, idrak və düşüncə baxımından bir-birindən fərqli səviyyədədirlər və bu fərqlilik bəzən yaradılışdan və fitrətdən olar, bəzən də mədəniyyətlərin fərqli olmasının və ya elmi səyahətlərin və alimlərlə görüşməyin ya da bir kimsənin, özünü insanların hiyləgərlik və hiylələrini anlamada əhliyyət sahibi edən, misal olaraq qazilik kimi bir vəzifədə olmasının və ya ticarət kimi bəzi dünyəvi işlərlə məşğul olmasının bir nəticəsi olaraq; sonradan qazanılmış olar.

Bəzən də Allah, fəzli ilə bir qisim insanlara bütün bu vəsilələri hazırlayar və onları fitrətən "sanki görüb eşitmiş kimi, sənin haqqında isabətli fərziyyələr irəli sürəcək qədər parlaq zəkalı" deyilən kimsələr halına gətirər.

Sonra onlara, çalışmaqla qazanılacaq vəsilələri də hazırlayar və onların qüvvətlərini artırar. Bütün bunlar keçmişdə və günümüzdə də olan şeylərdir.

Həmd olsun, Allah bunu istisnasız bütün islam alimlərinə və imamlarına nəsib etmişdir. Ancaq bu, onların hamısının eyni səviyyədə olmalarını göstərməz. Bu səbəblə, onların bu nöqtədən fərqli olmalarından bəzi ixtilaflar doğmuşdur. Bəzi misallar ilə bunu açıqlayaq:

İmam Əbu Hənifə (80-150), qiraətdə və hədis rəvayətində məşhur olan əl Aməşin (61-148) yanında idi. İmama bir məsələ soruşuldu və: "Bu məsələdə nə deyərsən?" - deyildi. İmam da: "Mənim görüşüm budur" - dedi. əl Aməş: "Bu görüşə necə qənaət gətirdin" - deyə soruşdu. İmam ona: "Əbu Salehdən, o da Əbu Hüreyrədən, Əbu Vaildən, o da Abdullah bin Məsuddan və Əbu İlyasdan, o da Əbu Məsud əl Ənsaridən olmaq üzərə Rasulullahın: "Xeyrə vəsilə olan, onu edən kimi əcir alar" - buyurduğunu bizə sən özün rəvayət etdin. Yenə Əbu Salehdən, o da Əbu Hüreyrədən Rasulullahın: "Ya Rasulullah, evimdə namaz qılırdım, yanıma birisi gəldi, onun yanıma gəlməsi xoşuma gəldi." - deyən birisinə, "Sənə iki savab var. Birisi gizli, digəri aşikar (ibadət) savabı" - dediyini də, bizə sən rəvayət etdin."

"Yenə əl Hakimdən, o da Əbul Hakimdən, o da Huzeyfədən, o da Rasulullahdan bunu rəvayət etdin.

Əbuz Zubeyrdən, o da Cabirdən mərfu olaraq bunu rəvayət etdin.

Yezid ər Rəqaşidən o da Ənəsdən mərfu olaraq bunu rəvayət etdin" - dedi. əl Amaş: "Bəsdi, bəsdi, sənə yüz gündə rəvayət etdiyimi mənə bir saatda rəvayət etdin. Sənin bu hədislərlə əməl edəcəyini təxmin etməmişdim. Siz fəqihlər təbibsiniz. Biz hədisçilər isə əczaçılar. Sən isə, ey Böyük adam, həm təbib, həm də əczaçısan" - dedi.[38]

İmam Əhməd də (164-241) İmam Şafiyə (150-204): "Bu məsələdə nə deyirsən?" - demiş, İmam Şafi də cavab vermişdir.

---

38. əl Cəvahirul mudiyyənin sonunda 2/484. Cəmiu bəyənil ilm 2/130-131.

Əhməd də: "Bunu nəyə dayanaraq deyirsən, Quran və hədisdən dəlil varmı?" - demişdir. Yenə İmam Əhməd belə dəvam etmişdir: "İmam Şafi bu mövzuda Rasulullahın bir hədisini rəvayət etdi ki, o həqiqətən nass bir hədis idi."[39]

əl Xatib də Tarixu Bağdad, 6/158-də, Hədis və Hənəfi fiqhi ricalından İsa bin Əbanın (v.220) biyoqrafiyasında Muhamməd bin Səmadan (v.223) belə rəvayət etmişdir: "İsan bin Əban, İmam Muhamməd bin əl Həsən əş Şeybaninin (129-187) namaz qıldığı və fiqh məclisi etdiyi məsciddə bizimlə bərabər namaz qılırdı. Mən onu Muhamməd bin əl Həsənin yanına getməyə dəvət edirdim, İsa bin Əban da: "onlar hədisə muxaləfət edənlərdir" - deyirdi. İsa, yaxşı bir hədis hafizi idi. Bir gün bizimlə bərabər sabah namazını qıldı, o gündə İmam Muhammədin dərs günü idi. Məclisə oturana qədər onu buraxmadım. İmam Muhammədin işi qurtardıqdan sonra ona yaxınlaşdım və bu Katib Əban bin Sadaqanın oğludur. Zəki və hədis mövzusunda bilgili birisidir. Mən onu sənə dəvət edirəm, qəbul etmir və bizim hədislərə muxaləfət etdiyimizi deyir, - dedim.

Muhamməd ona döndü və: "Ey oğlum, hədislərin hansına muxaləfət etdiyimizi görmüsən? Bizi dinləmədən, haqqımızda deyilənlərə inanma!" - dedi. O gün İsa, hədis ilə əlaqəli iyirmi beş məsələ soruşdu, Muhamməd də cavablarını verdi, mənsux olanları göstərdi və dəlillərini sıraladı.

Çıxdıqdan sonra İsa bin Əban mənə belə dedi: "Həqiqət nuru ilə aramda bir pərdə vardı, indi qalxdı. Allahın məxluqatı arasında, insanlara göstərdiyi belə birinin ola biləcəyini düşünməzdim." İsa, Muhamməd bin əl Həsənə (129-187) bağlandı və ondan fiqh öyrəndi.

Hər nə qədər bu son rəvayət irəlidə gələcək olan ikinci səbəb, yəni hədisə vaqif olma mövusundaki ixtilafları ilə əlaqəli dəlil təşkil etməkdəsə də, bu rəvayətin dediklərimiz üçün dəlil olduğu açıqdır.

39. İmam Subki, "Mənə qavlil imam əl muttalibi, s.99. Burada nassdan qəsd edilən, məqsədə açıqca dəlalət edən və açıq olduğu üçün başqa bir mənaya ehtimalı olmayan bir ləfzdir.

**İkinci Xüsus:** Anlayış fərqi səbəbi ilə, imamlar arasında ixtilafların meydana çıxmasına səbəb olan ikinci xüsusa gəlincə, o da hədislərin ləfzlərinin birdən çox mənaya imkan verməsidir.

Bu da görülən və müşahidə edilən bir xüsusdur. O halda bu fərqli anlayışların səhih ola bilməsi üçün:

- Ərəb dili baxımından məqbul və caiz olması, ərəb dilinə zidd olmaması və ya bu anlayışda məcburiyyət olmaması,

- Başqa nasslarla sabit olan digər hökmlərlə ziddiyət təkil etməsi lazımdır.

Mən bu iki şərti, məsələni biraz daha açıqlamaq üçün zikr edirəm, yoxsa ixtilaf səbəblərindən danışmaqda olduğumuz fiqh imamları bu mülahizələrdən xəbərsiz olmaqdan münəzzəhdir.

Bir nassın birdən çox mənaya gəlmə ehtimalı olması qarşısında, imamın bu iki mənadan birini tərcih etməsinə köməkçi olacaq səbəbləri araşdırmağa cəhd etməsi lazımdır.

Bir nassın birdən çox mənaya gəlmə ehtimalını bir misalla açıqlamamızda bir bəis yoxdur.

Rasulullahdan: "Alıcı ilə satıcı bir-birlərindən ayrılmadıqca muxayyərdirlər (yəni aldığı malı geri qaytarmaqda sərbəstdirlər)" - hədisi rəvayət edilmişdir. İmamlar buradakı təfərruqun (bir-birlərindən ayrılmağın) mənasında ixtilaf etmişlərdir. Qəsd edilən onların özlərinin ayrılmasıdır? Yəni, "alıcı və satıcı bir məclisdə və ya əqd yerində bərabər olduqları müddətcə, alıcı ilə satıcı əqdi icra və ya pozma arasında sərbəstdirlər. Biri digərindən uzaqlaşdığı və məclisdən ayrıldığı zaman, ikisinin də əqdə tabe olması lazımdır, ikisindən biri, digəri razı olmadan əqdi poza bilməz." - deməkdirmi? Necə ki İmam Şafi və başqaları bu görüşdədir.

Və ya ayrılmaqdan məqsəd, onların sözlərindən dönmələrimi deməkdir? Yəni: "Əqd edənlərdən hər biri, əqd mövzusuyla, onu əlaqədar edən xüsuslarda danışmağa davam etdikləri müddətcə,

əqdi icra və ya pozma arasında sərbəstdirlər. Əqd edib də başqa bir mövzuya keçərlərsə, ikisinin də əqdə tabe olması lazımdır. Digərinin razılığı olmadan, digəri əqdi poza bilməz" - deməkdirmi? Bu da Əbu Hənifə və başqalarının görüşüdür.

Hər iki tərəfin də dəlilləri vardır. Mən sözü qısa kəsmək üçün dəlillərin bir qismini zikr edirəm və məqsədim, bu yöndən ixtilaf səbəblərini açıqlamaqdır. Yoxsa hər iki tərəfin bütün dəlillərinin zikr etmək və iki məzhəb arasında tərcih etmək deyildir. Bu bizim kimilərin işi də deyildir.

İmam Şafi və onunla eyni görüşdə olanlar, görüşlərinin doğruluğunu isbat etmək üçün həm əsər, yəni nəqli, həm də nəzər, yəni əqli dəlillər gətirmişlərdir.

*Əsərə yəni nəqlə gəldikdə:* Hədisin ravisi Abdullah bin Ömərin tətbiqatını dəlil gətirmişlərdir. Çünki o, bir kimsədən bir şey satın aldığı zaman, ondan bir neçə addım uzaqlaşır, sonra işi varsa təkrar onun yanına gedərdi. Sahabənin, rəvayət etdiyi hədisi anlayışı, başqasının anlayışından daha çox doğruya yaxındır.[40]

*Nəzərə yəni əqlə gəldikdə:* Hədis "alıcı ilə satıcı, bir-birindən ayrılmadıqca sərbəstdirlər." - deməkdədir.

Əqd edəcək olan iki tərəfdə əsl olan, onların bir-birlərindən ayrı olmalarıdır. Yəni: Satıcı mağazasında olar, müştəri də evində olar. Müştəri satıcıya gedər və əqd yerində bir araya gələrək əqd edərlər. Sonra yerlərinə qayıdarlar. Bu onların bir-birlərindən ayrılmalarıdır. Rasulullah da (s.a.s) "bir-birlərindən ayrılmadıqca" sözü ilə onların yerlərinə dönmələrini qəsd etmiş olar ki, bu da hər birinin öz yerində olmasıdır. Allahu Aləm.

Əbu Hənifə və onunla eyni görüşdə olanlar da görüşlərinin doğruluğunu gərək nəqli, gərək əqli dəlillərlə isbat etməyə çalışmışlardır.

40. İmam Nəvəvinin, əl Məcmu, 9/197

Nəqlə gəlincə: “Ey iman gətirənlər! Qarşılıqlı razılıqla edilən alış-veriş müstəsna olmaqla, bir-birinizin mallarını haqsız bəhanələrlə (haqsız yerə) yeməyin və özünüzü öldürməyin! Həqiqətən, Allah sizə qarşı mərhəmətlidir!”[41] - ayəsini dəlil gətirmişlərdir. Ayə, əqdin bağlayıcı olması üçün qarşılıqlı razılaşmanın əsas olduğunu ifadə etməkdədir. Bu qarşılıqlı razılaşmanın əlaməti isə icab və qəbuldur (birisinin aldım, digərinin isə satdım deməsi). Bu da, ikisi arasında baş vermişdir.

“…bir-birlərindən ayrılmadıqca…” sözünün mənasına gəldikdə: ayəyə zidd gəlməməsi üçün, ona başqa bir məna verilər. Buna veriləcək məna “Sözləşmələrindən ayrılmadıqca” - deməkdir. Təfərruqun, səxslərin bir- birindən ayrılması mənasına gəlməsi mümkün olmayan bir şəkildə, sadəcə “sözləşmə və andlaşmadan dönmə mənasına gəldiyi bir çox şəri nass vardır.” Məsələn: “Allahın ipinə sarılın, bir-birinizdən ayrılıb dağılmayın. ( və lə təfərraqu)”[42] “Kitab əhli yalnız özlərinə açıq-aydın dəlil (Peyğəmbər və Qur´an) gəldikdən sonra (dində) ayrılığa düşdülər”[43] və bunların xaricində daha bir çox ayənin mənası belədir.

*Nəzərə gəldikdə*: Bu mövzudakı dəlilləri, Hafiz ibn Abdilbərrin “əl-İntiqa”, s. 149-da rəvayət etdiyi bu qissədə zikr edir: Sufyan bin Uyeynə belə demişdir: “Əbu Hənifə, Allah Rəsulunun hədislərini, fərqli misallar verərək, öz elmi (öz ağlı) ilə rədd edərdi. Ona Allah Rəsulunun “Alıcı və satıcının bir-birlərindən ayrılmadıqca muxayyərdirlər” - hədisini dedim. Əbu Hənifə “Əgər bir gəmidə olarlarsa, bir-birlərindən necə ayrılacaqlar, buna nə deyərsən?” - dedi. Süfyan isə: “Bu sözdən daha pis bir söz eşidilmişdirmi?” - demişdir.”[44]

41. Nisa surəsi, 29
42. Ali İmran surəsi, 103
43. Bəyyinə surəsi, 4
44. Süfyan bin Uyeynə öncə bu qənaətdəydi, sonra İmam Əbu Hənifə haqqında qənaətini düzəltmişdir. Əl Cəvəhirul Mudiyyə 1/166 səhifədə, Əbu Yusuf və tələbərindən olan Bişr bin əl Valid əl Kindinin (v.238) bir rəvayəti bunu göstərməkdədir. Bişr belə demişdir: “Biz İbn Uyeynənin yanında olardıq. Müşkil bir məsələ gəldiyi zaman, “Burada Əbu Hənifənin əshabından birisi varmı” - deyə soruşar, “Bişr var” - deyilər, o da “Bişr, bu məsələni həll et” - deyərdi, mən də həll edərdim. İbn Uyəynə: “Fəqihlərə tabe olmaq dinin salamatıdır” -

İmamın bu cavabı, məqsədini qısaca açıqlayan son dərəcə incə və ustaca bir ifadədir. İmam bunu demək istəmişdir: Əgər təfərruqdan qəsd, insanların bir-birlərindən ayrılmaları isə, elə hallar var ki insanların bir-birlərindən ayrılmaları mümkün deyildir. Məsələn: dənizin ortasında kiçik bir qayıq içərisində olarlar və bir-birlərindən ayrılmaları mümkün olmaz. Belə bir halda, ikisi arasındakı əqd məclisi mövcud olmağa davam edəcək, onlar günlərlə və ya daha uzun müddət uzansa belə, bu halda olduqları müddətcə də ortadan qalxmayacağından, bu məşəqqətli bir hala yol verəcəkdir.

Bu misal Süfyan bin Uyeynənin anlayışına tərs gəldikdə, Əbu Hənifənin hədisə ağlı ilə qarşı çıxdığını zənn etmişdir amma məsələ belə deyildir.

Bu, bir nassın iki mənaya gəlməsinə bir misal təşkil etdiyi kimi, birinci nöqtəyə alimlərin əqli və fitri mələkələri səbəbi ilə ixtilaf etmələrinə də misal təşkil edər. Allahu Aləm.

Son dərəcə əhəmiyyətli bir xüsusa işarət edə bilmək üçün, bu ana səbəblə, yəni imamların hədisi anlamadakı ixtilafları ilə əlaqəli misalları çoxaltmaq istəmirəm. Bu mühüm olan xüsus budur: Kitab və sünnədən çıxarılan bu şəri hökmlər, bu iki qaynaqdan uzaq, onlarla əlaqəsi olmayan şeylər deyildir. Kitab və sünnə necə İslamın iki ana qaynağı isə, bu ikisindən çıxarılan fiqh də, dərəcə baxımından bu ikisinə tabedir və fiqhi bu iki qaynaqdan ayırmaq caiz deyildir.[45]

Reyhanətus Sələf, İmam Abdullah bin əl Mübarəkdən (118-181) Allah ondan razı olsun. O, “Bu Əbu Hənifənin rəyidir” -

---

deyərdi.

45. Ancaq İmam Əvzainin (88-157) Təzkiratul Huffəz, s. 180-dəki “Alimlərin şazz görüşləri ilə əməl edən, İslamdan çıxar” sözünün şümuluna girənlər bundan xaricdir. İbn Abdilbərin sənədi ilə zikr etdiyi və Təzkiratul Huffəzdə yer aldığı kimi (s.151) Süleyman ət Teymi də (46-143) “Əgər hər alimin görüşünün rüxsət tərəflərini və ya hər alimin, qəbul edilməyən görüşlərini qəbul edib əməl etməyə çalışarsan, pisliklərin bütünü səndə toplanmışdır” - demişdir. Bu isə son dərəcə nadirdir və heç eşidilməmişdir. İmamların fiqhinin Kitab və sünnədən ayrılmadığının açıqlanması ilə əlaqəli olaraq baxın: Məqalətul Kövsəri, s.85

deməyin, lakin "Bu hədisin təfsiridir" deyin sözü[46] ilə bu mənaya işarət etmişdir.

İbn Hazm (v.457) bu mənaya daha açıq bir şəkildə işarət etmiş və belə demişdir: "Müctəhidlərin istinbat etdikləri bütün hökmlər, avam dəlillərini bilməsə də, şəriətdən sayılar və bunları inkar edənlər, imamların xəta etdiklərini və onların Allahın özlərinə izn vermədiyi bir hökmü bəyan etmiş olduqlarını demiş sayılar və bu sözü deyən də doğru yoldan sapmış birisidir."

Bu sözü, Mövlana Şeyx Zəfər Əhməd əl Osmani ət Təhanəvi "İncəul Vatan" s.53-də nəql etmiş və bu izahı əlavə etmişdir: "Mən deyirəm ki: Bu, qiyası qəbul etməyən zahirinin sözüdür. Onun Allahın şəriətinin qoruyucuları olan müctehid imamlara qarşı göstərdiyi bu ədəbə baxın! O, bu sözünü, əl Muhalləsini təlif etdikdən sonra söyləmişdir."

Hörmətli oxuyucu, İbn Hazmın (v.457) xüsusən "avam bunların dəlillərini bilməsə də" sözünə diqqət etməlidir. Çünki O, "avam" kəlməsini, üsul alimlərinin istifadə etdiyi mənada istifadə etmişdir. Üsulçular ami (avam sözünü), bilgi və araşdırmada hansı dərəcəyə yüksəlmiş olsa belə müctəhid olmayan hər kəs üçün istifadə etmişlərdir, yoxsa bizim burada qəsd etdiyimiz elm tələbəsi olmayanlar deyildir.

Nəticə olaraq İbn Hazmın demək istədiyi budur: Fəqih imamların fiqhi, şəriətdən məduddur (sayılı, hesablanmış, bir miqdar, az sayıda) və onların dəlillərini bilməyimiz şərt deyildir. Çünki onların dəlili, ya bizim anlaya bilmədiyimiz incəlikdə olduğu və ya bizə çatmadığı və yaxud da biz muttali (hakim olmaq) olmadığımız üçün, bizim tərəfimizdən anlaşılmaya bilər.

Əbu Hənifə və digər İslam alimlərinin fəqihlərinin, on minlərlə məsələdən mütəşəkkil fiqhi, Rasulullahın sünnəsinin təfsirindən başqa bir şey deyildir. Bunlar, İslama sonradan soxulmuş hökmlər

---

46. Aliyyul Qarinin, Əl-Cəvahirul-Mudiyyəyə zeyli, 2/460.

də deyildir. Onların heç bir görüşü, şəriət qaynaqlarından birinə dayanmadan başlarından uydurduqları şeylər deyildir.

Biz, “Əbu Hənifənin fiqhi, İmam Şafinin fiqhi” dediyimiz zaman, bunun mənası “Əbu Hənifənin anlayışı, İmam Şafinin anlayışı” deməkdir. Bu anlayış nə üçündür? Sadəcə Allahın kitabını və Rəsulunun sünnəsini anlamaq üçündür. Belədir, çünki məlum olduğu üzərə fiqh, ərəb dilində fəhm (anlayış) deməkdir.

Buradan, insanlar arasında, onların əhəmiyyət vermədikləri yayğın bir fahiş xətanı anlamamız mümkündür. Bu xəta, bəzilərinin öz fiqhlərini və insanlara ərz etdikləri elmlərini “Fiqhus Sünnə” və ya “Fiqhus Sünnəti vəl Kitab” adı altında təqdim etmələridir.

Sünnə və kitab fiqhi, bu ikisinin anlaşılma şəklidir. Ya onların təqdim etdiyi kimin anlayışıdır? Bu, Zeyd, Amr kimi tanınmayan insanların anlayışıdır. Lakin onlar bu anlayışı qaldırıb, insanlarda, onların insanlara dinin əsl qaynağını təqdim etdikləri zənnini canlandırmaq üçün (bu təqdirdə onlar insanları Əbu Hənifə, Şafi, Məlik və Əhmədin fiqhindən tamamən uzaqlaşdırmış və insanlara: “Ey insanlar, Muhammədin fiqhinimi istiyirsiniz yoxsa Əbu Hənifə və Şafininmi?” - demək imkanını əldə etmiş olacaqlardır) öz anlayışlarını kitab və sünnəyə əlavə etmişlərdir.

Onların bu sözü söyləmələri ancaq, öz fiqhlərini Quran və Sünnəyə əlavə edib, Əbu Hənifənin fiqhini kitab və sünnəyə deyil Əbu Hənifəyə, İmam Şafinin sözünü kitab və sünnəyə deyil İmam Şafiyə izafə etdikdən sonra mümkün ola bilər. Buna görə Kitab və Sünnənin bi haqqin sadiq bir şərhi olan bu böyük islami fikri, Kitab və sünnədən ayırıb doğru olanları, başqalarının süfrələrindən artıq qalanları, xətaları isə özlərindən, olan bir anlayışı insanlara gətirmişlər və görüşlərinin bütününü Kitab və sünnəyə izafə etmişlərdir.

Onların bu sözlərinə aldanan, sadəcə öz əsrlərində sünnənin, mərifət, rəvayət, təhəmmul, tələqqi, şərh, tərif və zəbt baxımından yayğın olmasına görə, dindarlıq, təqva, vəra, elm, anlayış və istinbat

qüvvəti xüsusunda imam olduqları qəbul edilmiş olan müctəhidlərin fiqhindən xəbərsiz olmalarından ötrü aldanmışlardır.

İslami elmlərin bütün budaqları ilə onları hər tərəfdən əhatə etmiş olan canlı bir elmi mühitin, bu günkü xələflərimiz üçün mövzu olmasına imkan yoxdur. Hətta beləki sən, alimlik edərək müctəhid olduğunu iddia etdiyin halda, insanlara dediyi çəkici sözləri yazarkən ərəb dilini doğru şəkildə istifadə edə bilməyən, Allah qatında etdiyi fahiş xətadan xəbəri olmayan və alimlik edib şəriətə təslim olduğunu göstərmək üçün, "ismət (məsumluq) Allaha məxsusdur" deyənləri görərsən. Allahı qoruyacaq kimdir? Nəydən qoruyacaqlar? Bu sözləri ilə əlaqəli bir dəlil varmıdır? Əgər dediyi sözün mənasını bilmirsə, fəlakət budur. Yox bilib də deyirsə, dində təcdid iddiasında olmadan öncə, getsin təcdidi iman ilə yenidən müsəlman olsun!

Allahdan bizi doğru yola hidayət etməsini, söz və fellərimizi istiqamət sahibi etməsini istəyirik.

# III SƏBƏB

## Zahirdə Bir-Birinə Zidd Kimi Görünən Hədislər Qarşısında Təqib Etdikləri Metoddakı İxtilaflar

Bu səbəb, fəqihlərin ixtilaf səbəblərinin ən əhəmiyyətlilərindən hesab edilir. Bu mövzuda iki mühüm elmdən faydalanmaq olar. Hədis elmi və Usulu Fiqh elmi.

Hədis elmi: Bir məsələdəki hədislər və bu məsələyə, istər yaxın istər uzaq əlaqəsi olan əsərləri (xəbər) bilmək üçün lazımdır.

Usulu Fiqh elmi isə: Kitab və sünnədəki digər nassların işığında, bu elmin qaydalarından və yerləşmiş hökmlərindən faydalanmaq üçün lazımdır.

Necə ki aşağıda görəcəyimiz kimi, bir-birinə zidd görünən nassların arasını cəm etmədə böyük rol oynayan, incə zəka və isabətli düşüncə də bu səbəbə daxil olmaqdadır.

Hədis elmini öyrənməyə yeni başlayan birisi də bilir ki, çox zaman bir məsələdə, hökmə dələləti fərqli olan və bəzən ikidən çox mənaya gələ bilən bir çox hədis ola bilər. Belə olduqda alimlər bu yolları təqib etmişdir:

1 – Bir-birinə zidd olan iki hədisin arasını cəm etmək və hər ikisini təvil edərək, ikisinin mənalarının bir-birinə uyğunluğunu təmin etmə metodu.

2 – Əgər ikisinin arasını cəm etmək mümkün olmazsa, nəsx prinsipinə baxılar və hədislərdən birinin digərini nəsx etdiyinə hökm edərlər.

3 – Əgər nəsx də mümkün olmaz və nəsxə köməkçi olan səbəblət də olmazsa, iki hədisdən birini tərcih yolu seçilər və hədisin birini digərinə tərcih edərlər.

Bəzi alimlər, üçüncü metodu ikinciyə tərcih edərək, öncə cəm edilər, olmazsa tərcih edilər, olmazsa nəsx edilər demişlərdir. Bu metodlardan bəhs edərsək söz uzanar. Bu mövzuda qısaca deyəcəklərim bunlardır:

1 – Anlayış, iki bir-birinə zidd olan hədisin cəm edilməsində ən böyük rolu oynayar. Bəzi alimlər, bu cür bir-birinə zidd olan iki hədisi anlaya bilmədikləri üçün, onların arasını cəm etmənin mümkünsüz olduğunu iddia edərkən, Allah başqa bir alimə, bu iki hədisin necə cəm ediləcəyini anlamağı nəsib edər. Bu səbəblə alimlər, zahirdə bir-birinə zidd görünən iki hədisi cəm etmənin mümkünsüz olduğunu iddia edə bilmək üçün, tələsməyib, məsələni yaxşıca incələyərək, əmin olmanın zərurəti üzərində əhəmiyyətlə durmuşlardır.

2 – Əgər iki hədisin arasını cəm etmək mümkün olmazsa, imam ikisindən birinin mənsux olub olmadığını incələməyə keçər. Buna qərar vermək üçün, buna köməkçi olacaq səbəblərin olması şərtdir. Bu səbəblərə "Muarrifətun Nəsx" deyilir. Bunlar dörd növdür:

**Birincisi:** Muslimdə yer alan "sizi qəbir ziyarətindən nəhy etmişdim, indi artıq ziyarət edə bilərsiniz" hədisində olduğu kimi, bir başa Allah Rəsulunun açıqlaması ilə bilinər.

**İkincisi:** İmam Nəsainin, Cabir bin Abdullahdan rəvayət etdiyi "Allah Rəsulunun ən son halı, atəş dəydiyi şeyləri yedikdən sonra dəstəmaz almağı tərk etmək olmuşdur" hədisində olduğu kimi, səhabənin açıqlaması ilə bilinən.

**Üçüncüsü:** Bəzi rəvayətlərdə hicri səkkizinci ildə olduğu deyilən Şəddad bin Əvsin "qan aldıranın da, qan alanın da dəstəmazı pozular" hədisinin; yenə bəzi rəvayətlərdə hicri onuncu ildə vəda həccində olduğu deyilən, İbni Abbasın "Allah Rəsulu, ehramlı və

oruclu olduğu halda qan aldırdı" hədisiylə nəsx edilməsi kimi, nəsx, tarix sayəsində bilinər.

Bəzən nəsx, nəsxə dəlalət edən səbəblərlə bilinər. Məsələn, bir hədisi rəvayət edən səhabənin, daha sonra müsəlman olmuş olması və hədisi eşitdiyini açıqca ifadə etmiş olması kimi, bu təqdirdə bu hədis, ondan daha öncə müsəlman olmuş və müsəlman olduğu zaman onu Allah Rəsulundan eşitmiş olan bir səhabənin rəvayət etdiyi hədisi nəsx edər.

**Dördüncüsü:** Hədisin əksinə bir icma olması ilə nəsx edildiyi bilinər. Bu icmanın olub olmadığı və icmaya muxalifət edənin olub olmadığını təsbit etmək, son dərəcə çətin bir işdir.

3 – Əgər nəsx də mümkün deyilsə imam, iki hədisdən birini tərcih edər.

İki hədis arasında tərcih etmək isə məşəqqətli və son dərəcə çətin bir işdir. Çünki birinci qism (iki hədisin arasını cəm etmək) anlayış və dirayət istər, ikinci qism (nəsx qismi) də, buna hakim olmağı və buna dəlalət edən bir rəvayətin mövcudluğunu gərəkdirər. Tərcih isə, həm dirayət həm də rəvayət istər. Dirayət, yüksək bir anlayış və parlaq bir zəka istər. Rəvayət də, bir məsələdəki hədislərlər əlaqəli bütün külli və cuziləri bilməyi gərəkdirər. Hədislərin istinadları isə çox yorucudur. Bu hədisləri rəvayət edən səhabələri, həyatlarını, sifətlərini, hədisdə istifadə etdikləri ləfzləri və buna bənzər xüsusları bilmək lazımdır.

Usul alimləri, bir-birinə zidd olan iki hədisdən birini tərcih edilməsi lazım olan səbəblərin nələr olduğunu təsbitdə çətinlik çəkmişlərdir. əl Həzimi (548-584) "əl İtibər fin Nəsx vəl-Mənsux minəl-Asar" adlı əsərinin müqəddiməsində bu məsələyə təmas etmiş və tərcih səbəblərinin əllisini zikr etmişdir. Xüsusən bu səbəblərin bir çoxuna misal da vermişdir. Bu bəhsi bitirərkən də (səh.23də) "bunlardan başqa bu müxtəsəri uzatmamaq üçün zikr etmədiyimiz daha çox səbəb vardır" - demişdir.

Sonra Hafiz əl İraqi (725-806) gəlmiş və İbnus Salahın (v.643) "Ulumul Hədisinə" yazdığı haşiyədə, əl Həziminin bu sözünü nəql etmiş və "tərcih səbəblərinin sayı yüzdən çoxdur. Həziminin bunları

müxtəsər olaraq zikr etdiyini gördüm. Öncə Həziminin zikr etdiyi əlli səbəblə başlıyıram, sonra davamında digərlərini zikr edəcəm" - demiş və 110 səbəb zikr etmişdir. Sözlərinin sonunda belə yazmışdır: Bunların xaricində başqa tərcih səbəbləri vardır. Bəzilərinin qəbulu munaqişəlidir (yəni digər bir qismi də məqbuldur deməkdir), eyni ilə zikr etdiyimiz səbəblərin bəziləri də munaqişəlidir.

Buradan zahirdə bir-birinə zidd olan iki hədis gördüyü zaman, bir çox tərcih səbəbi arasında başqa səbəblərə heç etibar etmədən, Səhiheyndəki hədisləri səhiheyndə olmayan hədislərə tərcih edən bəzilərin cəhalətini (və ya cahil kimi görünmələrini) anlayırıq. Halbuki Hafiz İraqi, tərcih səbələrini sıra ilə zikr edərkən "Hədisin Səhiheyndə olması, Səhiheyndə olmayan hədislərə tərcih edilmə səbəbidir" şərtini, 110 şərt içərisində 102-ci sırada zikr etmişdir.

Bu adamlar istər qafil olaraq, istər qafil kimi görünərək 101 tərcih səbəbini hədər etməkdədirlər. Elmin həqiqi öndərləri ilə alimlik iddia edənlərin fərqi budur! Allah hamımıza hidayət və salamatlıq ehsan etsin.

İmamların fiqhi görüşlərindəki ixtilaflarının olduğu bu geniş sahədə bir tək fiqhi hökmdə belə ictihadın nə qədər çətin olduğunu və eyni şəkildə, imamlarımızın nə qədər yüksək bir elmi səviyyəyə çatmış olduqlarını anlamamız mümkündür. Eyni ilə mənim zikr etdiklərimin, müctəhidin bilməsi lazım olan digər bir çox elmdən əlavə, sadəcə üzərində durduğuqlarımız ilkin məlumatlardan ibarətdir.

Üçüncü səbəb ilə əlaqəli olaraq dediklərimin sonunda, çox da ixtilaf mövzusu olmamış və imamların "Tövbə surəsi xaric, bəsmələnin Qurandan bir ayə olması, İmama tabe olanın qiraəti, rükuya əyilib qalxdıqda əllərin qaldırılması" mövzularında əsərlər təlif etdikləri kimi, üzərində əsər təlif etmədikləri bəsit bir nöqtəylə əlaqəli bir mətin nəql edəcəm.

Bu mətni nəql etmənin yeganə səbəbi, bəhs etmiş olduğumuz üç metodu, bir tək məsələdə toplamış olmasıdır.

İmam Nəvəvi "Şərhu Sahihi Muslim", 14/80 da "Ağarmış saçların, sarı vəya qızıla boyanmasının müstəhəb, qaraya boyanmasının haram olduğuna dair bab"da belə deməkdədir: Məzhəbimizə

görə, qadın və kişinin ağarmış saçları sarı və qızıl rənglə boyaması müstəhəb, qaraya boyaması isə ən səhih görüşə görə haramdır. Qara rənglə boyamasının tənzihən məkruh olduğu da deyilmişdir. Tərcih edilən, "Qara rəngdən çəkinin." - hədisinə əsasən haram olmasıdır. Məzhəbimiz budur.

Qadi İyad belə demişdir: Səhabə və Tabiindən olan sələf, rənglənib rənglənməməsində və rəng seçimində ixtilaf etmişlərdir. Bir qismi rəngləməyi tərk etmək fəzilətlidir demiş və Rasulullahın ağarmış saçları boyayıb rəngini dəyişdirməkdən nəhy etdiyini, çünki özünün də ağarmış saçlarının rəngini dəyişdirmədiyini rəvayət etmişlərdir. Bu görüş, Ömər, Əli, Ubey və başqalarından nəql edilmişdir.

Digərləri də boyanın fəzilətli olduğunu demişlərdir. Səhabə, Tabiin və daha sonra gələnlərdən bir qrup İmam Müslim və başqalarının zikr etdiyi hədislərə dayanaraq ağarmış saçlarını boyamışlardır.

Sonra onlar yenə ixtilaf etmiş, çoxu sarıya boyamış, (İbn Ömər, Əbu Hureyra və başqaları bu görüşdədir, bu görüş Əlidən də rəvayət edilmişdir) bəziləri də xına və kətən bitkisiylə, bəziləri isə zəfəran ilə boyamışlardır.

Bir qismi isə qara rənglə boyamışdırlar. Bu Osman, Əlinin oğulları Həsən və Hüseyn, Uqbə bin Amr, İbn Sirin, Əbu Burdə və başqalarından rəvayət edilmişdir.

Qadi İyad belə davam etmişdir: ət Təbəri demişdir: "Doğrusu budur ki, saçın ağlarının boyanması və boyanmasının qadağan edilməsi ilə əlaqəli olaraq, Rasulullahdan rəvayət edilən bütün hədislər səhihdir və aralarında ziddiyyət yoxdur. Boyamasını əmr etdiyi kimsələr, saçının ağları Əbu Kuhafəninki kimi olanlardır. Onun saçı son dərəcə bəyaz olduğu üçün, gözəl görünmürdü. Qadağan olunmuş kimsələr isə saçlarının bəyazı az olanlardır."

Təbəri belə davam etməkdədir: "Sələf bu xüsusda vəziyyətə görə hər iki görüş ilə də əməl etmişlərdir. Üstəlik buradakı əmr və nəhyin, vacibiyyət ifadə etmədiyində icma edilmişdir. Bu səbəblə sələfdən birisi, digərinin görüşünə etiraz etməmişdir."

Təbəri eyni ilə bu ikisindən birisinin nəsx digərinin mənsux olduğunu söyləməkdə doğru deyildir demişdir.

Qadi İyad belə demişdir: Bir digəri isə belə demişdir: Bu məsələ iki şəkildədir: Bir kimsənin yaşadığı bölgənin adəti boyamaq vəya boyamamaq isə, o kimsənin adəti tərk etməsi göstəriş üçündür və məkruhdur. İkincisi: Bəyaz saçların zərafətinə görə dəyişər. Bəyazları, boyanmışından daha gözəl görünən birisinin boyamanı tərk etməsi əvladır. Qadi İyadın nəqletdikləri bunlardır. Bunların ən doğrusu və sünnəyə uyğun olanı nəqletmiş olduğumuz məzhəbimizin görüşüdür. Nəvəvinin sözü burda bitdi.

Keçmiş imamlar, görünüşdə mutəarid (bir-birinə zid) olan hədisləri toplayıb, bunları tədqiq edərək, araşdırma əsnasında ortaya çıxan nəticələri açıqlamaya böyük bir ehtimam göstərmişlərdir. Bu mövzuda, İmam Şafi “İxtiləful-Hədisi”ni, İbn Quteybə “Təvilu Muxtəlifi-Hədisi”ni (bəzi yerlərdə tənqidə məruz qalmışdır) təlif etmişdir. Bu iki kitab çap edilmişdir. Katib Çələbi Kəşfuz Zununda Zəkəriyya əs Sacinin “İxtiləful-Hədis” isimli bir əsəri olduğunu zikretməkdədir.

İmam İbn Cərir ət Təbərinin “Təhzibul-Asar” adlı bir kitabı vardır. Katib Çələbi bu əsər haqqında “Bu sahədə yazılmış bənzərsiz bir əsərdir” - demişdir.

İmam Əbu Cəfər ət Tahavinin də bu mövzuda iki böyük əsəri vardır. Birisi “Şərhu Məanil Asaril Muxtəlifətil Məsura”-dır, bir neçə dəfə çap edilmişdir. Əsər onun imam və muctəhid olduğuna şəhadət etməsi ilə yanaşı, Hafiz əl Quraşinin “əl Cəvahirul Mudiyyə”-sində zikr etdiyinə görə,eyni zamanda İmam Tahavinin ilk əsəridir.

Onun ikinci əsəri “Muşkilul-Asar”dır, bir neçə dəfə çap edilmişdir, dörd ciltdir. Lakin Allamə əl Kövsərinin “əl Havi” adlı əsərində səh.34-də dediyinə görə, çap edilmiş bu qism əslinin yarısı qədər belə deyildir.

Bunlardan başqa bu xüsusda yazılmış müstəqil əsərlər, kitablarda yer almış olan araşdırma və məqalələrdə vardır.

# IV Səbəb

## Sünnəni Anlamaqdakı Fərqliliqlərdən Çıxan İxtilafların Açıqlanması

Bu səbəbdən danışarkən, sözə İmam əş Şafinin (150-204) "ər-Risalə" əsərindəki bu sözləri ilə başlamaq istəyirəm: "Sünnənin bütününə vaqif olmuş və bilmədiyi hədis olmayan birisini tanımırıq. Bütün hədis alimlərinin elmləri bir araya gətirilsə, o zaman bütün sünnə əhatə edilmiş olar. O alimlərin elmləri dağınıq bir halda olduğu üçün, o alimlərin də bilmədikləri hədislər əlbəttə olacaqdır. Sonra onun bilmədikləri, başqaları tərəfindən bilinməkdədir. O alimlər hədis elmi baxımından bir neçə təbəqədirlər. Bəziləri hədislərin əksəriyyətini bilir. Bəziləri də başqalarının bildiyindən daha az bilgiyə sahibdir."

Bir insanın Allah Rəsulunun hədislərinin bütününü bildiyini iddia etməsi, müctəhid imamlardan İmam Şafinin də dediyi kimi, mümkün deyildir.

Hədisləri əzbərləyib, onlara vaqif olma mövzusunda, imamların fərqli səviyyələrdə olmalarının mənası; məsələn, onlardan ən çox hədis biləni, tabe olunması mövzusunda ən çox haqq sahibi olacaq demək deyildir. Onun çox hədis bilməsi, başqalarından üstün olması üçün səbəb təşkil edə biləcəyi kimi, fiqh və istinbat mövzusunda dərəcəsinin yüksək olması da, bir başqasının ondan üstün olması üçün səbəb təşkil edə bilər.

Hədislərə vaqif olmaqla əlaqəli olaraq, birisinin ictihad dərəcəsinə çatması və onun müctəhid olduğunun qəbul edilə bilməsi üçün lazım olan şərt, o kimsənin hədislərə geniş bir şəkildə vaqif olmasıdır. Bütün imamlar bunun üzərində ittifaq etmişlərdir.

Məsələn, İmam Əhməd (164-241), bu sahədə məşhur birisidir. Eyni ilə İmam Malik (95-179), İmam Şafi (150-204) və bəzi kimsələr onun haqqında şübhə izhar etmiş olmasına baxmayaraq Əbu Hənifə də (80-150) belədir. Onun haqqındakı bu şübhədən ötrü, digərlərini buraxıb, sadəcə İmam Əbu Hənifədən qısaca bəhs açacağıq.

Hədis bir baxıma təhəmmül və eşitmə, digər tərəfdən də rəvayət və əda deməkdir.

Mühəddis öncə, hədisi şeyxlərindən dinləyər, “Təhəmmülül Hədis” dedikləri budur. Sonra da bunu başqalarına rəvayət edər, buna da “əda” deyilir.

Rəvayət etdiyi hədislər çoxaldıqda, insanlar onun təhəmmülünün az və ya çoxluğuna dəlalət edən rəvayətlərinə sahib olarlar. Lakin hədisin rəvayətiylə məşğul olmadığı təqdirdə, bəzi vəsilələrlə rəvayət etmiş olduğu hədislər, onun təhəmmülünün az və ya çoxluğuna dəlalət etməz.

Hz.Əbu Bəkr (r.a) kişilərdən ilk müsəlman olan, Rasulullahla ən çox bərabər olan və səhabənin şəhadətiylə, onların ən alimi olan birisidir. Buna baxmayaraq Hz.Əbu Bəkrdən bizə, onun əshabın ən alimi olduğunu göstərməsi bir yana, əshabın digər alimlərindən biri olduğuna dəlalət etməsi belə mümkün olmayacaq qədər az rəvayət nəql etmişdir. Bunun belə olmasının bir çox səbəbi vardır ki, bu artıq ayrı bir mövzudur.

Səhabədən Hz. Ömər, Hz.Osman və Hz.Əlinin rəvayətləri də Hz.Əbu Bəkirin (Allah hamısından razı olsun) rəvayət etdiyi hədislərin sayına yaxındır. Tabiin və onlara tabe olanlardan da, bu halda olanlar çoxdur.

İmam Malikin belə rəvayətləri azdır. Halbuki tələbəsi İmam Şafi onun haqqında demişdir: “İş hədisə gəlincə, Malik bu sahənin ulduzudur. O, öz əlləri ilə yüz min hədis yazmışdır.”[47]

Hətta, Alləmə əz Zurqani, Muvatta şərhinin müqəddiməsində 1/7-də İbnul Həyyabdan, İmam Malikin yüz min hədis rəvayət etdiyini nəql etməkdədir.[48]

47. Tərtibul Mədərik, 1/121-124
48. Rəvayət və təhəmmül bir-birindən fərqlidir. Onlardan birisi bir şeyi rəvayət edərkən,

İmam Şafi də eyni hal üzərədir. Kitablarında mövcud olan hədislər, onların hədis elmində imam olmaları və bu sahədə məhşur olmalarına mütənasib olacaq qədər çox deyil.

Bəzilərinin "İmam Şafi səhih olduğunu bildiyi hər hədisi kitablarında zikr etmişdir" - sözü, bütün hədislərə deyil, sadəcə əhkam hədislərinin səhih olanlarına həml edilər.

Malik və Şafinin rəvayətlərinin az olmasının səbəbi, onların fiqh, fiqh təhsili, ictihad, istinbat, ictihad və fiqhin əsaslarının təsbitinə, hədis rəvayətindən daha çox ağırlıq verməleridir. Yoxsa onların hədis bilgilərinin və vaqif olduqları hədislərin azlığından deyildir. Tam əksinə onlar çox hədis toplamış, lakin az rəvayət etmişlərdir.

İmam Əbu Hənifənin halı da belədir. Çox hədis toplamış amma az rəvayət etmişdir. Bunun belə olduğuna açıq şəkildə dəlalət edən bir çox rəvayət vardır. Bunlardan bəziləri belədir:

Əz Zəbidi, "Uqudul Cəvahirul Munifə" səh32-də belə rəvayət etmişdir: Yəhya bin Nəsr belə demişdir: "Əbu Hənifənin yanına getdim. Ev kitablarla dolu idi. Bunlar nə?" - dedim. "Bunlar hamısı hədisdir, bunlardan ancaq faydanıla biləcək qədər çox azını rəvayət etdim" - dedi.

Aliyyul Qari də "əl Cəvahirul Mudiyyə"yə əlavə olaraq çap edilmiş olan Mənaqibində (2/474) Muhammməd bin Səmadan (v.233) "Əbu Hənifənin əsərlərində yetmiş min hədis rəvayət etdiyini və "əl-Asar" adlı əsərini qırx min hədisdən seçərək meydana gətirdiyini" - rəvayət etmişdir.

İmam Əhmədin "Dörd yüz min hədisi əzbərləmiş olanın ictihad və fətvaya əhil ola biləcəyini" - söylədiyi irəlidəki səhifələrdə gələcəkdir. Onun muasiri olan və daha sonra yaşamış olan imamlar, Əbu Hənifənin fəqih və müctəhid olduğunu, hətaa bütün alimlərin fiqhdə onun elminə möhtac olduqlarını qəbul etmişlərdir. Bunun mənası, Əbu Hənifənin dörd yüz min və bundan çox hədisi bilməsi deməkdir.

---

bildiyi halda rəvayət etmədiyi bir çox hədis oxuyardı. Təhzibul Təhzibdə 8/463-də, İmam, müctəhid əl Leys bin Sadın biyografiyasında belə deyilməkdədir: "Şuayb bin Leys belə demişdir: Leysə,"Biz səndən kitablarında olmayan hədisləri eşidirik" - deyildiyində belə cavab vermişdir: "Əzbərimdə olanların hamısı kitablarımdamı? Əgər bütün əzbərlədiklərimi yazmış olsaydım bu gəmiyə sığmazdı." – dedi."

Bu görüşdə olan və ictihada əhil olmaq üçün bu qədər böyük miqdarda hədisi əzbərləmə şərtini qoşan imam Əhməd də, İmam Əbu Hənifəni tərif edən, böyük imamlardandır. İmam əl Ayni bunu, "əl Binayə" əsərində zikr etmiş, Allamə Zəfər Əhməd ət Təhanəvi də bunu "Qavaid fi Ulumil Hədisində" səh.328-də nəql etmişdir.

Allamə əs Salihi əş Şafi, Uqudul Cumanında "səh.63 və 319-da" İbn Həcər əl Məkki əl Heytəmi əş Şafi "əl Xayratul Hisən" "səh.23də" əz Zərəncəridən bunu nəql etmişdir: "İmam Əbu Hafs əl Kəbir, İmam Əbu Hənifənin şeyxlərinin sayılmasını əmr etmişdir. Tabiindən olanların sayı dörd min olmuşdur." Sonra əs Salihi onun şeyxlərindən bir qismini, hərf sırasına görə səhifə 64-87-də, iyirmi üç səhifə halında zikr etmişdir. Bu, o qədər böyük bir rəqəmdir ki, onun xaricində hədis elminə özünü həsr etmiş olan başqası üçün zikr edilməmişdir.

Yenə, "əl-Xayratul-Hisən" əsərinin 25 və 26-cı səhifələrində belə demişdir: Əbu Yusuf (113-182) belə demişdir: "Hədisin təfsiri xüsusunda Əbu Hənifədən daha elmlisini görmədim. Səhih hədisi tanımada məndən daha dirayətli idi."

İmam Əbu Yusuf  ki, cərh və tədil elminin imamı, hədis hafizlərinin sultanı Yəhya bin Main onun haqqında belə demişdir: "Rəy əhli içərisində, hədis mövzusunda Əbu Yusufdan daha sağlam, ondan daha böyük hafiz və rəvayəti ondan daha səhih olan birini görmədim." Bunu əz Zəhəbi, "Mənaqibu Əbi Hənifə və Sahibəyhi" adlı əsərinin 40-cı səhifəsində zikr etmişdir.

Yenə eyni əsərin 61-ci səhifəsində Əbu Yusufun belə dediyi rəvayət edilmişdir: "Əbu Hənifə bir görüş üzərində qərar verdiyi zaman, onun görüşünü dəstəkləyən bir hədis  və ya əsər tapa bilmək üçün Kufə şəhərinin alimlərini gəzərdim. Bəzən iki vəya üç hədis tapar ona gətirərdim. O da hədislərin bəzisinə "Bu səhih deyildir" və ya "Maruf deyildir" - deyərdi. Mən də ona "Sənin görüşünə uyğun olduğu halda, bunların illətini necə bilirsən?" - deyərdim, o da mənə: "Mən Kufə alimlərinin bütün elmini bilirəm" - cavabını verərdi."

Kufəyə səhabədən min beş yüz  kişi gəlmiş və buranı elmlə doldurmuşlardır. Hətta Əli bin Əbu Talibin şəhadətiylə, burasını İbn Məsudun elmi doldurmuşdur. əl Müsnəd 1/405-də, İbn Məsuddan

onun əshabını topladığı və onlara "Vallahi mən elə ümid edirəm ki, hal-hazırda içinizdə Din, fiqh və Quran elmində, digər İslam bəldələrindəki alimlərdən daha üstün kimsələr yetişmiş durumdadır." - dediyi nəql edilmişdir.

əl Hakim də, "Marifətu Ulumil-Hədis" adlı əsərinin 240-cı səhifəsində 49-cu olaraq ayrı bir elm növü təsbit etmiş və ardından: "Elmlərdən bu növü tabiin və daha sonrakılardan hədisləri əzbər və müzakirəyə, özləri ilə və isimləriylə təbərrük edilməyə layiq, şərq və qərbin məşhur siqa imamlarını bilməkdir" başlığı ilə xüsusi bir bab ayırmış və Mədinə-i Münəvvərədən qırx, Məkkə-i Mükərrəmədən iyirmi bir və Kufədən iki yüz bir ravini zikr etmiş, bunlar arasında Əbu Hənifəni də saymışdır.

Əbu Hənifə həm öz ifadəsiylə, həm də başqasının ifadəsi ilə Küfə alimlərinin bütün elmlərini toplamışdır. Buxarinin Səhihində zikr etdiyi şeyxlərindən Yahya bin Adəm belə demişdir: "Əbu Hənifə, bəldəsinin bütün hədislərini toplamış və vəfatına qədər bunları tədqiq etməyə dəvam etmişdir."[49]

əs Sayməri "Əxbəru Əbi Hənifə və Əshabihi" adlı əsərində, sənədi ilə birlikdə, əl Həsən bin Salihdən (siqa, fəqih və abidlərdəndir) onun belə dediyini rəvayət etmişdir: "Əbu Hənifə, hədislərin nəsx və mənsuxunu çox titizliklə araşdırar, Rasulullah və əshabından rəvayət edilən, səhih olduğunu gördüyü hədislərlə əməl edərdi. Küfəlilərin rəvayət etdiyi hədisləri və onların fiqhi görüşlərini yaxşı bilərdi. Olduğu bəldənin alimlərinin əməl etməkdə olduğu xüsuslara tabe olmaqda titizlik göstərərdi. O, Quranın nəsx və mənsuxu vardır deyərdi. Vəfatına qədər Rasulullahın ən son əməl etdiyi xüsuslardan Kufəyə nələr intiqal etmişsə, Əbu Hənifə onları bilərdi."

Rasulullahın vəfatından öncə, ən son əməl etməkdə olduğu hökmləri bilməyin əhəmiyyətini öyrənmək üçün, əl Xatibin əl Fəqih vəl Mutəfəqqih 1/222-də Yahya bin Adəmdən nəql etdiyi bu sözə baxmaq lazımdır: Yahya bin Adəm belə demişdir: "Rasulullahın sözü varkən başqasının sözünə ehtiyac yoxdur. Ancaq Rasulullahın

49. Allamə Təhanəvi, İncəul vatan anil izdirai bi iməmiz zəmən s.10

vəfatı əsnasında bu şəkildə əməl etdiyi bilinsin deyə, Rasulullahın Əbu Bəkr və Ömərin sünnəsi" - deyilirdi.

İmam Əbu Hənifənin elmi, sadəcə bölgəsinin hədislərinə sərhədli qalmamışdır. Əlavə olaraq O, Hicazlıların rəvayətlərinin tamamını bilirdi. Bu rəvayətlərə Yezid bin Ömər bin Hubeyrənin, istəmədiyi halda onun məcburən qazilik vəzifəsini etməsindəki israrının nəticəsi Kufədən ayrılıb Məkkəyə yerləşdiyi zaman öyrənmişdir. Onun Məkkəyə gəliş tarixi h. 130-cu ildir. Sultan Əbu Cəfər əl Mənsur 136 ilində[50] hakimiyyətə gəlincəyə qədər Kufəyə qayıtmamışdır. Bu müddət, bir müctəhidin həyatında və Məkkə kimi hər il həccə gələn alimlərin və muhəddislərin məkanı olan elmi bir mühit üçün qısa sayılmaz.

Buna, onun mənəqibi ilə əlaqəli əsərlərdə zikr edildiyinə görə, əlli beş dəfə həcc etdiyi də əlavə edilməlidir. Hər səfərində o, Məkkə, Mədinə və digər İslam bəldələrinin alimləriylə görüşürdü. Bundan ötrü əs Salihinin "Uqudul Cuman", səh.64-87-də zikr etdiyi onun şeyxləri arasında Məkkəli, Mədinəli və digər şəhərlərdən bir çox isim görərsən.

Az öncə əl Hakimin Əbu Hənifəni Küfəli ravilər, Tabiin və sonrakilərdən, hədisi əzbər və müzakərəyə, özləriylə və isimləriylə təbərrük edilməyə layiq, şərq və qərbin məşhur siqa imamları arasında zikr etdiyini görmüşdük. Məlumdur ki, bir insanın hədisi, əzbərlənmək və müzakərə üçün, ancaq o insan çox rəvayət edən birisi olduğu zaman toplanar.

İmam Əbu Hənifə icazətən rəvayəti caiz görməzdi. Bu görüş, cərh və tədil elmində zamanının imamı olan Şöbə (Şubə) bin əl Həccacdan da nəql edilmişdir. Şöbə bu məsələdə belə demişdir: "Əgər icazətlə rəvayət caiz olsa, rihlə (hədis rəvayəti üçün edilən səyahətlər) ortadan qalxardı."[51] Hədis rəvayət etmək üçün sayəhətlərə çıxmaq şərt olduğuna görə, Əbu Hənifə ancaq öz bəldəsinin ravilərindən hədis almaqla necə kifayətlənə bilərdi?

50. əs-Salihi, Uqudul-Cuman, səh.312
51. Suyuti, tədribur ravi, 256

Bu mövzuda daha çox şey deyilə bilər, ancaq burada zikr etdiklərimdən artığını lazımlı görmürəm. İmam Əbu Hənifənin fərqli cəhətlərdən bu cəhətini, Allamə, Muhəqqiq, hafız, fəqih, şeyx Zəfər Əhməd əl Osmani ət Təhanəvi "İncaul Vatan anil İzdirai bi İməmiz Zəmən" adlı əsərinində geniş bir şəkildə ələ almışdır. Bu əsərdə, başqa yerdə bir arada tapılması mümkün olmayan nəqillər yer almışdır.

Bəzi səviyyəsizlər, artıq bundan sonra da yenə bu imam haqqında söz söyləməyə cürət edəcəklərmi?

Bütün bunlarla bərabər, hamımız qəbul edirik ki, bu böyüklüyünə rəğmən, nə Əbu Hənifə nə İmam Şafi, hədislərin hamısını əhatə etmiş deyillərdi. Hər biri zamanında alimlərin ən fəzilətlisi olmaqlarına baxmayaraq Malik, Əhməd, Sövri, Leys, Əvzai haqqında da deyiləcək budur.

Bu imamların, sünnənin az bir qisminə muttali (hakim) ola bilmədiklərini göstərən bir neçə misal vermək istəyirəm:

İmam Əbu Hənifə, birisi bir şeyi vəqf etdiyi zaman, onun vəqfə riayətinin şərt olmadığını və bundan dönməsinin caiz olduğunu, ancaq vəqf vasiyət yolu ilə və ya qazinin hökmü ilə olarsa bunun istisna olduğunu demişdir. İmam, vəqfə riayətin şərt olduğu haqqında hər hansısa bir rəvayətə sahib olmamışdır.

Bu məsələdə, bütün əshabı və digər imamlar ona muxaləfət etmişlər və vəqfə riayət etməyin şərt olduğunu demişlərdir. Hənəfi məzhəbində fətva, Əbu Yusuf və Muhammədin "vəqfin icrası şərtdir" görüşü üzərə verilmişdir.

İsa bin Əbanda belə demişdir: Əbu Yusuf (119-182) Bağdada gəldiyi zaman İsmail bin Uleyyə (110-193) ona, İbn Avn – Nafi – İbn Ömər yolu ilə Ömərin Xeybərdən hissəsinə düşən ərazisini vəqf etməsiylə əlaqəli rəvayətini nəql edənə qədər, vəqflərin satılmasının caiz olduğunu deyən Əbu Hənifənin görüşündəydi. Əbu Yusuf (113-182) bu rəvayəti eşidəndə demişdir: "Bu muxaləfət edilməsi

mümkün olmayan bir şeydir. Əgər Əbu Hənifə bunu eşitmiş olsaydı, onu qəbul edər və ona muxalif bir görüş qəbul etməzdi."[52]

İbn Əbi Hatim ər Razi (240-327), əl-Cərhu vət-Tadilinin müqəddiməsində səhifə 31-də sənədiylə İmam Malikin ən öndə gələn əshabından olan Abdullah bin Vəhbdən bunu rəvayət etmişdir: "Malikə, dəstəmaz alarkən ayaq barmaqlarının arası açılaraq yuyulmasının hökmü soruşuldu, Malik, "Şərt deyildir" - dedi, mən də səs çıxartmadım. Sonra onun yanındakılar dağılıb getdikdə Malikə: "Bu məsələ ilə əlaqəli hədis vardır." - dedim. Malik "Nədir o?" - dedi. Mən, "Bizə əl Leys bin Sad və İbn Ləhi və Amr bin Haris (üçü də) Yezid bin Amr əl Maarifidən, o da Əbu Abdurrahman əl Həbəlidən, o da əl Mustəvrid bin Şəddad əl Quraşidən, onun Rasulullahın, əlinin kiçik barmağı ilə ayaq barmaqlarını araladığını gördüm." - dediyini rəvayət etdi" - dedim. Malik, "Bu həsən (məqbul) bir hədis. İndiyənə qədər bunu eşitməmişdim" - dedi. Sonra Malikə bu məsələ soruşulduqda, ayaq barmaqların aralanmasını əmr etdiyini eşitdim."

Əl-Beyhəki Mənaqibuş-Şafii, I cild, 528-də, İmam Əhmədin (164-241) belə dediyini rəvayət edir: "əş-Şafii (150-204) bizə, "Siz hədis və rical müvzusunda məndən daha məlumatlısınız. Səhih bir hədis olduğu zaman (raviləri) istər Kufə, istər Bəsrə, istər Şami olsun mənə xəbər verin ki, o hədisin hökmünə tabe olum" – dedi."

İbnul-Qayyum Kitabur-Ruhunda (səh. 13) belə deyir: əl-Xalləl (v. 321) "el-Cami"-in "Kitabul-Qiraəti ində əl-Qubur" qismində belə buyurur: "Bizə əl-Abbas bin Muhammed əd-Duri, Yahya bin Maindən; O, Mubəşşir əl-Haləbidən; O da Abdurrahman bin əl-Alə bin əl-Lecləcdən; O da atasından təhdis etdi. Atası belə demişdir: Mən öldüyüm zaman məni qəbrə qoy və "Bismilləhi və alə Sünnəti Rasulilləhi" - de və torpağımı yaxşıca düzəlt, sonra baş ucumda Bəqərənin baş tərəfini oxu, çünki mən Abdullah bin Ömərin belə dediyini eşitdim"

əl-Abbas əd-Duri (v. 271) demişdi ki: Əhməd bin Hənbələ (164-241) "Qəbrin başında Quran oxunmasına dair bir rəvayət bilirsən-

52. Allamə əl-Kövsəri, ən-Nukətut-Tarifə, səh.40

mi?" - deyə soruşdum. "Xeyr" - dedi. Yahya bin Maindən (161-234) soruşdum, O bu hədisi rəvayət etdi:

əl-Xalləl də belə demiştir: Mənə əl-Hasan bin Əhməd əl-Varraq, Əli bin Musa əl-Haddadın (sadıq kimsə idi) belə dediyini rəvayət etmişdir: "Əhməd bin Hənbəl (164-241) və Muhammməd bin Qudamə əl-Cevhəri (v. 237) bir dəfn mərasimində idilər. Ölü dəfn edilən zaman kor bir adam qəbrin başında Quran oxumağa başladı. Əhməd həmin adama: "Qəbir başında Quran oxumaq bidətdir" - dedi. Qəbristanlıqdan çıxdığımız zaman Muhammməd bin Qudamə Əhməd bin Hənbələ dedi: "Ey Əbu Abdullah! Mubəşşir əl Haləbi (v. 200) haqqında nə fikirləşirsən, ondan heç hədis yazdınmı?". Əhməd "Bəli" - dedi. Bunun üzərinə "O halda Mubəşşir mənə Abdurrahman bin əl-Ləcləcdən, O da atasından, atasının qəbrə qoyulduğu zaman qəbrin başında Bəqərə surəsinin baş və son qisimlərinin oxunmasını vəsiyyət etdiyini və İbn Ömərin belə vəsiyyət etdiyini"-rəvayət etdi. Əhməd bin Hənbəl ona: "Qayıt və o adama Quran oxumanın caiz olduğunu söylə" - dedi.

Bunlar nadir olmaqla bərabər imamların bəzi hədislərdən xəbərləri olmadığına və həyatlarında və ya vəfatlarından sonra, əshabından bəzilərinin, onların bu vəziyyətlərinə göz yummayaraq bunu düzəltdiklərinə; bir kimsənin sünnəni tamamilə əhatə etməyəcəyinə dair rəvayətlərdir. Kamal sifəti ancaq Allaha məxsusdur.

Bu ixtilaf səbəbi ilə əlaqədar bəzi şübhələr vardır ki, onlara İnşəAllah toxunacağıq. Ancaq onlara keçmədən öncə bəzilərinin ağlıma gələn bir sualını cavablandıracağam.

Sual budur: Niyə bu səbəbi sonda zikr etdin?

Cavab: Mən bunu bilərək, qəsdən etdim. Ayrıca bəzi kimsələrin çıxışlarında, yazılarında bu səbəbi zikr etdiklərini, bunu ixtilaf səbəblərindən birincisi kimi qəbul etdiklərini və imamlardan birinin bir hədisi tərk etdiklərini gördükləri zaman "İmam bu hədisi görməmişdir, əgər görmüş olsaydı onun hökmünü qəbul edərdi. Görməmişdir, çünki bir adamın tək başına sünnənin tamamını bilməyi mümkün deyildir" - dediklərini bildiyim üçün zikr etdim.

Lakin iki səbəbdən bu kimsələrə təəccüb edirəm:

Birincisi: Onlar imamın bir hədisi görmədiyinə və dolayısıyla ona müxalif bir görüşə sahib olduğuna dair kiçik belə olsa bir dəlil əldə etmək üçün O imamın bütün əsərlərini gözdən keçirməyiblər. Elm əhlindən bəzilərinin: "Əbu Hənifə "Fatihəsiz namaz olmaz" hədisini görməmişdir" - dediyini eşitdim. Halbuki, Əbu Hənifə bunu dəfələrlə nəşr olunmuş, şərh edilmiş əlimizdə mövcud olan məşhur "əl-Müsnəd"-ində rəvayət etmişdir.

Əgər bu iddiada olan şəxs, imamın bütün əsərlərini tamamən incələyib bu əsərin eynisinə rast gəlməsəydi belə, yenə də imamın bu hədisi bilmədiyini söyləmək caiz olmazdı. Əgər səhih bir hədisi Buxari və Muslimdə axtarsaq və tapmasaq bu imamların həmin hədisi görmədiklərini iddia etmək doğru olarmı?

Əgər iddia etsən demək ki, "çox böyük imam"imişsən sən!!!

İkincisi: Bir imamın bir hədisə agah olmadığını söyləyən, sadəcə öz ağlından və müsəlmanların imamlarından biri haqqında məlumatsız, dəlilsiz danışmaqdadır. Sanki imamın özü "Mən bu hədisi eşitməmişəm" - deyib.

Dolayısıyla, bu səbəbin son olaraq zikr edilməsi, elm məntiqinin və imamlara qarşı göstərilməsi lazım olan İslami tərbiyənin gərəyi olan təbii bir haldır.

Ağıllı bir müsəlman ilk öncə özünü ittiham edər və imamlara dil uzadaraq onların hər hansı bir hədis haqqında məlumatsız olduğunu iddia etməz.

İmam əs Subkinin "Məna Qavlil İməmil Muttalibi" səhifə 99-da, İmam Əhməd bin Hənbəldən nəql etdiyi bu rəvayətə diqqətlə baxın:

əs-Subki deyir: Əbu Əyyub Hamid (Humeyd) bin Əhməd əl-Basri belə demişdir: "Əhməd bin Hənbəllə bir məsələni müzakirə edirdik. Bir nəfər Əhmədə dedi: "Ey Əbu Abdullah! Bu barədə səhih hədis yoxdur". Əhməd ona: "Əgər bu mövzuda səhih hədis yoxdursa belə əş-Şafiinin (150-204) görüşü var. Onun dəlili bu mövzuda ən sağlam şeydir" - dedi.

Sonra İmam Əhməd sözünə davam etmiş və adama özü ilə əş-Şafii arasında olan bir qissəni danışmışdır. Bu, əş-Şafii bir görüş irəli sürdüyü zaman onun mütləq sünnədən bir dəlilə dayanmış olduğunu lakin bu dəlilin, həm də kimə, İmam Əhməd kimi birinə qapalı qalmış olduğunu göstərir.

İmam Əhməd belə demişdir: "əş-Şafiiyə "Bu məsələyə nə deyirsən?" –dedim. Bunun üzərinə əş-Şafii bu mövzuda nəss olan bir hədis söylədi. Yəni, hədis əş-Şafiinin görüşünə o dərəcədə açıq bir şəkildə dəlalət edirdi ki, hədisin ləfzinin başqa bir mənaya gəlmə ehtimalı yox idi.

İmam Əhməd kimi birisi bu qədər yüksək ədəb sahibidirsə, hər bir müsəlmanın eyni şəkildə hərəkət etməyi lazımdır. Allah bizi bütün xeyirlərə müvəffəq qılsın.

Bu sonuncu səbəblə əlaqədar olaraq ortaya atılan şübhələr bunlardır:

1. Birisi belə deyə bilər: İmamların bəzi hədisləri görmədiyini dəlillər ilə göstərdiyinə görə, buna baxaraq onlar haqqında "Yenə bu məsələdə, o imamın başqa şeyləri, eyni ilə üçüncü və dördüncü ilaxir... məsələdə başqa şeyləri görməmiş olması da mümkündür" deyilə bilər. "O halda bir məsələdə mutmain ola bilməyimiz üçün dəlili özümüz araşdırmalıyıq" - deyilə bilər.

Cavab: İmamın görmədiyi şeylər nadir və az olub. Əshabı onu bu mövzuda tamamlamışdır. Əbu Hənifənin əshabından Əbu Yusuf (113-182) və Muhamməd (129-187); əş-Şafiinin əshabından əl-Muzəni (v. 264) və əl-Buveyti (v. 231); Malikin əshabından Əşhəb (140-204) və ibn əl-Qasım (v. 191); həmçinin Əhmədin (164-241) də əshabından bunlar kimi bir qrup imam öz məzhəblərini tamamlamışlar və bu surətlə bu məzhəblər möhkəmlənmişlər.

O, İslamın qızıl çağında yaşamış müctəhid bir imam ikən bəzi şeyləri görməmişdirsə son saflarda olan bir muqallid, əsas məsələlərlə bağlı bir çox şeyi heç görməmişdir.

İmam, az rast gəlindiyi üçün misal vermək belə çətin olduğu çox az məsələlərdə bəzi şeyləri görmədiyi zaman, nadir olan bir hökmü bütün məsələlərə şamil etmək ağıl və elm məntiqinə sığmaz. Əksinə, məntiq bütünün hökmünün nadir olan məsələlərə şamil edilməsini tələb edir.

Yəni, biz "İmam bu hədisi görməmiş və filan məsələdə bu hökmü vermişdir. Onun bu hədisi görmədiyi ehtimalı vardır. Bu səbəblə də filan məsələdə bu hökmü vermişdir. Bu şəkildə bu ehtimal imamın ictihadlarının hamısı üçün keçərlidir. Buna görə də biz imamlardan ayrı olaraq özümüz yeni bir fiqh təsis etməliyik. Çünki, bu ehtimal qarşısında imamlar arasında fərq yoxdur" - deyə bilmərik.

Əksinə belə deməliyik: İmam filan məsələnin dəlilinə agah olmuş və o dəlilə görə hökm vermişdir. İkinci bir məsələ də, onun dəlilinə agah olmuş və o hökmün qənaətinə gəlmişdir. On minlərlə məsələ bu şəkildədir. Bu məsələyə gəlincə on minlərlə məsələdən sadəcə bir dənəsidir - onun dəlilinə vaqif olmamışdır."- deyərik və imamın başqa dəlillərə agah olduğunu bildiyimizdən burada dayanarıq və artıq heç bir şey deməri. Bu vəziyyət sayılmayacaq qədər çoxdur.

2. Bəziləri də belə deyərlər: Bugün hədis kitabları çoxdur. Bugünkü araşdırmaçılar keçmişdə qədimlərin əlində olandan daha çox sayda hədisə sahibdirlər. Bu əsərlərin istifadə imkanı qədimlərə nisbətən daha çoxdur. Bu səbəbdən bu əsərlərə müraciət etmək, orada sabit olan hökmləri alıb digərlərini tərk etmək, orada dəlili olan fiqhi hökmləri təsbit edib, dəlili olmayanlardan ayırmaq daha rahat olacaq.

Bunun cavabı bir neçə nöqtədən verilə bilər:

a) Bu gün ən böyük hədis kitabı əl-Muttaqi əl-Hindinin "Kənzul-Ummal"ıdır. Bu əsərdə 46.000 hədis var. Ancaq bu əsərdən yuxarıdakı sözü söyləyənin dediyi kimi istifadə etmək mümkün deyildir. Çünki, qaynaqların çoxuna müraciət edib, hədisin sənədinin tədqiqi mümkün deyildir. Deməli iş hədislərin sənədlərinin bilinməsinə bağlıdır.

b) "Kənzul-Ummal"-dakı hədislərin sayı müctəhid imamların eşitdikləri və özlərindən nəql edilmiş hədislərin sayından çox azdır. İmam Əbu Hənifənin zikr etmədikləri bir yana sadəcə əsərlərində zikr etdiyi hədislərin sayının yetmiş min olduğunu əvvəlki səhifələrdə qeyd etmişdik. Yenə orada imamın "əl-Əsər" adlı əsərini 40.000 hədisdən seçərək ərsəyə gətirdiyi bildirilmişdir.

Daha əvvəlki səhifələrdə də, İbnul-Heyyəbdən İmam Malikin eşidib lakin rəvayət etmədikləri xaric, 100.000 hədis rəvayət etdiyi də keçmişdir. İmam Əhmədin (164-241) əl-Müsnəd adlı əsərini 750.000 hədisdən seçdiyi məşhurdur.

"İlamul-Muvaqqı"-ın, I cild səh.45-də zikr edildiyinə görə bir nəfər İmam Əhməddən soruşmuşdur "Bir kimsə 100.000 hədis əzbərlərsə fəqih olarmı?" İmam: "Xeyr" - demişdir. "Bəs 200.000 hədis əzbərlərsə?". İmam yenə: "Xeyr" - demişdir. "Bəs 300.000 hədis əzbərlərsə?", İmam yenə "Xeyr" - dedi. "Bəs 400.000 hədis əzbərləsə?" - deyə soruşduqda. İmam əliylə "elə-belə" işarəsi etdi. (yəni əl işarəsi ilə "belə bir adam bəlkə insanlara fətva verən bir fəqih ola bilər" - deyə bildirmişdir)

Hərçənd bu böyük miqdarlar içərisində mövquf[53], məqtu[54], muqarrar[55] isnadlı hədislərin daxil olduğu inkar edilə bilməz. Lakin məvquf rəvayətlərlə, muqarrar isnadlı rəvayətlə -bu kimi muqarrar isnadlı hədislərin hər birinin ləfzi dəyişik olmaqdan xali deyil - hədisi anlamaq və ondan istifadə etməkdə böyük rolu olduğundan, yenə də böyük fərq vardır.

c) Bu qədər çox hədisin mövcud olduğunu fərz etsək belə, digər ixtilaf səbəbləri mövcud olmağa davam etdiyi müddətcə imamlar arasındakı ixtilaflar ortadan qalxmaz və davam edər. Digər ixtilaf səbəblərinin imamların ixtilafındakı rolu bəhs etməkdə olduğumuz dördüncü səbəbdən çox böyükdür.

53. Səhabəyə nisbət edilən söz, del, təqrir və davranışlarına aid xəbərlərə deyilir.
54. Hər hansı bir tabeuna nisbət edilən söz, fel və təqrirlərə deyilir.
55. Təkrarlanan hədislər.

d) Yenə mövcud hədislərin ictihad üçün yetərli olduğunu fərz etsək belə, hədislərin çox olması ictihad üçün tək başına yetərli deyil. Bəs ictihad üçün lazım olan digər şərtlər hansılardır? Müctəhidin üsul ilə bağlı öz seçdiyi hökmləri və qaidələri qoya bilməsi üçün bütün İslami elmlərdə: Usulud-din (Tövhid), Təfsir, Fiqh və Fiqh üsulunda imam olmalıdır. Onun başqasının üsul prinsiplərinə əsaslanması caiz deyildir. Əgər əsaslanarsa ictihad iddiasında olduğu halda muqallid olar. Ayrıca, ərəbcənin müxtəlif sahələrində; Nahiv, Sarf, Lüğət; İştiqaqda və Maəni, Bəyan və Bədi kimi bəlağət elmlərində də imam olmalıdır.

Ayrıca ibadət, təqva, vəra, zühd, nəfs təzkiyyəsi kimi saleh əməllərlə və İslam dininin fəzilətləriylə təchiz olunmağı və bu sahədə də imam olmağı lazımdır.

ət-Təbəraninin "əl-Mucəmul-Əvsat"-ında Hz. Əlidən rəvayət etdiyi bir hədisdə Rasulullah (ﷺ) bu xüsusa diqqət çəkmişdir. Hz. Əli "Ya Rasulullah! Bir məsələ ilə qarşılaşdığımda bununla əlaqədar bir əmr və ya nəhy tapa bilməsək nə etməliyik?" - demişdir. Rasulullah (ﷺ) da "O məsələdə fəqihlərə və abidlərə müraciət edin. Bir tək görüşə görə əməl etməyin" - cavabını vermişdir. əl-Heysəmi "Məcmauz-Zəvaid" kitabında (1/178) bu hədisin ravilərinin, rəvayətləri səhih siqa biriləri olduğunu bildirmişdir. əs-Suyuti də Miftəhu'l-Cənnə, səh. 40-da bu hədisin səhih olduğunu söyləmişdir.

Rasulullah (ﷺ) bu hədisdə elm və anlayışla bərabər ibadətin də şərt olduğuna işarə edərək "Fəqihlərə və abidlərə..." - deyə buyurmuşdur.

əd-Dariminin əs-Sünnəsində (I/ 49) mürsəl olaraq rəvayət etdiyi bu hədis də bu mənanı dəstəkləməkdədir. Rasulullaha (ﷺ) Kitab və Sünnədə cavabı tapılmayan, sonradan ortaya çıxacaq məsələlərdə necə bir yol izləmək barədə soruşduqda, O (ﷺ): "O məsələdə möminlərin abidlərinə müraciət edilər" - deyə cavab verdi.

ən-Nəsai əs-Sünənində (VIII.230) İbn Məsuddan onun belə dediyini rəvayət etmişdir: "Bizim hökm vermək halında olmadığımız zaman keçdi, sonra Allah (c.c) bizim gördüyünüz mövqeyə çatmağı-

mızı təqdir etdi. Bu gündən etibarən içinizdən hər kim hökm vermək mövqeyində olarsa Allahın Kitabı ilə hökm etsin. Əgər hökmü Quranda tapılmayan bir məsələ ilə qarşılaşarsa Rasulullahın (ﷺ) hökm etdiyi ilə hökm etsin. Əgər hökmü Quran və Sünnədə tapılmayan bir məsələ ilə qarşılaşarsa salehlərin verdiyi hökmə uysun. Əgər nə Quran və Sünnədə hökmü bilinən, nə də Salehlərin hökm vermədiyi bir məsələ ilə qarşılaşarsa özü ictihad etsin. Mən qorxuram deməsin. Halal bəlli, haram bəllidir. Bunun xaricindəkilər şübhəlilərdir. Şübhəli olanı tərk et, şübhə olmayanı seç”. Əbu Abdurrahman, yəni İmam ən-Nəsai demiştir: “Bu hədis son dərəcə sağlamdır (cəyyidun cəyyidun)”.

Sonra sənədiylə Ömər bin əl-Xəttabın Qadi Şurayha (v.80) göndərdiyi məktubu rəvayət etmişdir ki, o məktubda tamamən bu mənadadır.

Məşhur siqa ravilərdən və Əbu Hənifənin (80-150) tələbəsi Əbu Yusufun (113-182) dostu Hafs bin Qiyasın (117-177) verdiyi hökmləri tədqiq etdiyi zaman Əbu Yusuf  belə demişdir: “Hafs və onun kimiləri, gecələri çox namaz qılmaqla (İlahi) köməyə layiq olurlar”. Gecə ibadətləri salehlərin şüarıdır. Bir dəfəsində də, “Hafs Allahın rızasını qorumuş, Allah da onu müvəffəq qılmışdır”, digər rəvayətə görə gecə ibdətlərindən dolayı Allah onu müvəffəq etmişdir”-demişdir.[56]

Təzkiratu’l-Huffəz, səh.526 və Təhzîbu’t-Təhzib, VI. 448-də özünün əshabından Abdulvahhab bin Abdulhakim əl-Vərraq (v. 250) haqqında Əhməd bin Hənbəl (164-241): “Saleh bir adamdır. Onun kimisini Allah haqqa isabət etməyə müvəffəq qılar” - demişdir.

Hətta onlar elmə: namaz, ibadət, qorxu və zühd kimi sifətlərə yiyələnmək üçün, elm öyrənməyə başlamadan əvvəl Allaha çoxlu ibadət edərdilər. İbn Əbu Hatim, əl-Cərhu vət-Tadilinin müqəddəməsində (səh.95) İmam, müctəhid Sufyan əs-Sevrinin (97-161) “Bir kimsə elm öyrənmək istədiyində, başlamadan əvvəl 20 il ibadətlə məşğul olardı” - dediyi rəvayət edilmişdir.

56. əl-Cəvahirul-Mudiyyə, I, 222-223

3 - Bu səbəblə bağlı son şübhə də budur: Onlardan bəzisi belə deyər: Əgər müctəhid imamların hamısı sünnəyə tamamilə agah olsalardı, onların biri belə hər hansı bir məsələdə zəif bir hədisi dəlil olaraq istifadə etməz və bu imama müxalif olan başqa imamın əlində bu zəif hədisə qarşılıq səhih bir hədis tapılmazdı. Çünki, səhih olduqda zəifə ehtiyac qalmaz. İmamın zəif hədisi dəlil olaraq istifadə etməsi, onun bu səhih hədisi görmədiyinə dəlalət edir.

Cavab: İmamlar sünnəyə tamamilə agah idilər. Onların həyatlarını  araşdıran, insaflı və qəlbi onlara qarşı şübhələrdən uzaq olaraq incələyən birisi bunun belə olduğunu görəcəkdir.

İmamların 46.000 səhih hədis olduğu halda zəif hədislərlə istidlal etməyinə gəlincə isə insaf sahibi hər kəs bilir ki, bu sözdə bir şişirtmə var və həqiqəti əks etdirmir. Buna aydınlıq gətirmək üçün bir neçə nöqtəyə toxunmaq lazımdır:

**Birinci nöqtə:** Bir məzhəb imamının dayandığı dəlillər sadəcə o məzhəbin fəqihlərinin kitablarında, o məzhəbin dəlili olaraq zikr etdikləri hədislərdən ibarət deyil. Bəli, çox vaxt məzhəb imamının dəlil olaraq istifadə etdiyi hədisi zikr etməkdə məzhəb imamı ilə müttəfiqdirlər. Lakin bu razılıq imamın seçmiş olduğu görüşün dəlili olaraq zikr etdikləri hər hədisə şamil olunmur.

Zikr etdikləri fiqhi hökm o imamın verdiyi hökümdür. Lakin çox vaxt dəlil imamın dəlili deyil. Bu sadəcə o müəllifin, imamının verdiyi hökmə uyğun bildiyi və hökmün dəlili olaraq zikr etdiyi bir hədisdir. Məzhəb imamının isə başqa bir dəlili vardır ki, onu ən yaxşı Allah bilir.

Bu mülahizə ən çox Hənəfi məzhəbi üçün keçərlidir. Çünki, Əbu Hənifə fiqhini və dəlillərini şəxsən özü tərtib etməmişdir. İmam Malik və İmam Əhməd də həmçinin. İmam əş-Şafii əl-Umm adlı əsərində fiqhinin və dəlillərinin ancaq az bir qismini zikr etmişdir.

Məsələn Hənəfi, əl-Mərğinaninin (v. 593) əl-Hidayəsində; Şafii əş-Şirazinin (393-476) əl-Muhəzzəbində; Maliki ibn Əbi Zeyd əl Qayravaninin (v. 386) ər-Risaləsində və Hənbəli ibn Qudamənin (v.

620) əl-Muğnisində və digər kitablardakı çox sayda hədis, əslində o məzhəbin imamının dəlili deyil.

Məzhəbin kitablarından birinin hədislərini təxric etmiş olan bəziləri, məzhəblərdən birinə nöqsan isnad etmə xətasına düşüblər. Çünki, onlar bu kitabın hədislərinin çoxu haqqında mühəddislərin "Mövzu bir hədisdir, zəif bir hədisdir, mərfu[57] olaraq belə bir hədis bilinməməkdədir" - dediklərini görmüş və bu hədislərin şəxsən məzhəb imamının dəlili olduğunu zənn etmişlərdir. Mövzu hədislərlə istidlal edər, mövquf və məqtu hədisləri rəfə qaldırarsa, onun Allahın şəriətində imam və müctehid olduğunu necə qəbul etmək olar?!

**İkinci nöqtə:** Bəzən fəqih bir dəlili zikr edər və dəlil həqiqətən də imamın dəlilidir. Sonra bir mühəddis məzhəb imamlarından sonra yaşamış mühəddislərin kitablarından; Sünəni Ərbaa, Müsnədlər və Mucəmlər və s. kitablardan o hədisi tapar və bu müctəhid imam bu hədisi özünə xas bir isnadla dəlil olaraq istifadə etməyə əlverişli səhih bir sənədlə rəvayət etmiş olduğu halda, o kimsə bu kitablardakı isnadlara baxaraq o hədisin zəif və ya mövzu olduğuna hökm edər və təbii o zaman bu hədis də dəlil olaraq istifadə etməyə əlverişli olmayacaqdır.

Hər kim hədisi, Əshabi-Təxricin etimad etdikləri əlində olan qarışıq hədis kitablarındakı mühəddislərə aid tariqlərdən[58] incələyərsə hədisin dəlil olmağa daha əlverişli olmadığını görər və imamı pisləməyə, ayıblamağa girişər və içində gizlədiklərini ağzından qaçırar.

Hər kim də o hədisi haqqı ilə araştırarsa, şəxsən məzhəb imamlarının kitablarında axtarar və taparsa, onun səhih və dəlil olaraq istifadə etməyə əlverişli olduğunu görər və hakimin haqqını təslim edərsə, imamların həqiqətən imam olduğunu qəbul edərək onlara boyun əyər, onları pisləyənlərə də əksini edər.

İndi isə bunun misalını görək:

---

57. Hz.Peyğəmbərə (sallallahu aleyhi və səlləm) nisbət edilən söz, fel və təqrirlər.

58. Leksik mənası yol anlamına gələn "tariq" kəlməsi, hədis elmində bir hədisin sənədinə verilən digər bir isimdir.

Fəthul-Qadir şərhi ilə birlikdə olan əl-Hidayədə (IV. 139) əl-Mərğinani (v. 593) “Şübhəli vəziyyətlərdə hədd cəzalarını qaldırın” - hədisini zikr etmiş və mərfu olduğunu demişdir. əz-Zeylai də bunu Nasbur-Rayədə (III. 333) sənədindəki kəsinti ilə birlikdə Hz. Ömərin və ayrıca Muaz bin Cəbəl, İbn Məsud, və Ukbə bin Amirin sözü olaraq təxric etmişdir. Bunlara çatan isnadda İbn Əbi Fərvə vardır ki, mətruk[59] bir ravidir. Eyni sözü əz-Zuhrinin sözü olaraq rəvayət etmişdir. əz-Zuhri (50-124) tabeindəndir və sözü (şəri bir) dəlil olmaz.

İbn Hazm (v. 457) bu hədisin mərfu olduğunu qəbul etmədiyindən, əl-Muhallada (XI. 152, 153) ona və bu hədislə əməl edən fəqihlərə sərt bir dillə tənqid etmiş və adəti üzrə uzun-uzun yazmışdır.

əl-Kəmal bin əl-Humam (v. 861) da Fəthul-Qadirdə ona cavab vermiş və hədisin doğruluğunu Sahiheyndəki bəzi hədislərlə isbat etmiş və belə demişdir: “Rasulullahdan və Əshabdan rəvayət edilənlər incələndiyi zaman bu məsələ tam şəkildə həllini tapır. Necə ki, Rasulullahın (ﷺ) zina etdiyini bildirdikdən sonra Maizə “Hər halda sən onu öpdün, bəlkə də sadəcə təmas edib toxundun”-dediyini və hər dəfəsində onun “Bəli, elədir” deməyini ona təlqin etdiyini bilirik. Bunun, Maiz bu “Bəli, elədir” sözünü söyləyincə buraxılmaqdan başqa bir mənası və faydası yoxdur. Əks təqdirdə bu sözlər faydasız və mənasız olardı.

Rasulullah (ﷺ) borcunu etiraf edənə: “Bəlkə də səndə əmanət idi və itib” və ya buna bənzər şeylər deməyib. Xülasə bütün bunlardan hədd cəzalarının şübhə qarşısında qaldırılacağı anlaşılmaqdadır. Bu şərən sabit olan dəqiq bir mənadır. Buna şübhə etmək zəruri bir şeydə şübhə etmək deməkdir.

Bu nəfsi bir incələmədir. Bunun nəticəsi hədisin səhih və mərfu bir tariqlə sabit olduğunu ortaya qoymasıdır.

Bu “Şübhəli vəziyyətlərdə hədd cəzalarını qaldırın” - hədisini Əbu Hənifə də Müsnədində rəvayət etmişdir. Müsnədin “Kita-

59. Leksik mənası, tərk edilmiş, buraxılmış, qəbul edilməmiş deməkdir. Hədis elmində isə, sənədində yalan söyləməklə ittiham edilmiş və ya gündəlik həyatında yalan danışdığı sabit olan bir ravinin olduğu hədisə mətruk hədis deyilir.

bul-Hudud"-un dördüncü hədisidir. (Bax: Matbaatu Şerikəti'l-Matbuati'l-İlmiyyə tab'ı, səh.32). Ayrıca Allamə əs-Sunbuhlinin Tensiqu'n-Nizam Şərhu Musnədi'l-İmam adlı əsərinin (Karaçi tab'ı) 157 səhifəsində zikr edilmişdir. Sənədi budur: Miqsəm (v. 101) İbn Abbasın "Rasulullah (ﷺ): "Şübhə halında hədd cəzalarını qaldırın"-buyurdu" - dediyi rəvayət edilmişdir.

Miqsəm siqadır. Öz dövründə Misirin İmamı Ahməd bin Salih əl-Misri (170-248), əl-İcli (182-261), Yaqub bin Sufyan (v.277) və əd-Dəraqutni (306-385) onun siqa olduğunu söyləmişdir. İbn Abbasın isə kimliyi məlumdur! Mərfu olaraq İbn Abbasa çatan bundan başqa səhih bir isnad yoxdur.

Buradan aydın olur ki, məzhəb imamlarının özlərinə xas isnadları vardır. Yenə aydın olur ki, onların fiqhinin hədislərini mümkün olduğu öz əsərlərindən təsbit etmək zəruridir. Əgər mümkün olmazsa o hədisləri digər mühəddislərin əsərlərindən və bu mühəddislərin təxric etdikləri hədislərə baxıb, imamlar əleyhinə hökm verməmək və bu hədisləri onların məzhəblərinin zəifliyinə dəlil saymamaq şərtilə təxric edərik.

Mən bu mülahizədə Allamə, Fəqih Qasım b. Qutlubuğa əl-Cəmalinin, "Munyetu'l-Əlmə'i fî-mə Fətəmin Təxrici'l-Hidəyəti li'z-Zəylə'i" adlı risaləsindən faydalandım. Çünki O Nasbu'r-Rayənin əksiklərini tamamladığı hədislərin çoxunu Hənəfi fiqhinin gərək hədis və gərəksə də fiqhə dair ana qaynaqlardan çıxarmışdır.

**Üçüncü nöqtə:** Bəzən fəqih imamların dəlili olan hədislərin istər özlərinə aid, istərsə də mühəddislər tariqiylə olsun isnadların zəif olduğu doğru ola bilər. Lakin onların Quran və Sünnədən və ya hər ikisindən bunları dəstəkləyəcək saysız dəlilləri olur.

Bu mülahizə: İmam İbnul-Humamın "Şübhə halında hədd cəzalarını qaldırın" hədisinin zəif olduğunu qəbul etməklə bərabər hədisin mənasını möhkəmlətməkdə təqib etdiyi yoldan anlaşıla bilər.

Bu nöqtəni ortaya qoyan digər misal budur: Fəqih, İbn Abbasın: "Boşanma haqqı yalnız qadınla evlilik münasibətində olana (kişiyə) aiddir" mərfu hədis ilə istidlal edərək boşanma haqqının kişiyə aid

olduğunu söyləmişdir. Bu hədisi İbn Macə (1.672-də) Yahya bin Bukeyr-İbn Ləhi  yolu ilə rəvayət etmişdir. İbn Ləhiə zəif və yalan danışan  ravidir. Hədisi İbn Macədən başqası da rəvayət etmişdir. O tariqlər də zəif ravilərdən xali deyildir. Bu hədis haqqında söylənəcək şey eş-Şəvkəninin, Nəylul Əvtardakı (VI. 253) "Hədisin müxtəlif tariqləri bir-birini möhkəmləndirər" - sözüdür. Hədisin həsən olduğunu söyləyənlər də bu səbəbdən demişlərdir.

Bununla belə, bu hədisin zəif olduğunu qəbul etsək belə, onun dəlil olaraq istifadə edilməsini tənqid etməyimizə ehtiyac yoxdu. Çünki, o zəif hədisi dəstəkləyən və boşamanı qadına deyil kişiyə aid edən Quran ayələrindən dəlillər vardır. Allah (c.c) "Ey Peyğəmbər! Qadınları boşadığınız zaman onları təmizlik müddətində boşayın"[60] və "Qadınlarınızı boşadığınız və onların gözləmə müddəti başa çatdığı zaman onları..."[61] və "Boşanan qadınlar üç dəfə (heyz görüb təmizlənincəyə qədər başqa ərə getməyib) gözləməlidirlər "[62] - burumuşdur. Bunun bənzərləri çoxdur.

İbn əl-Qayyum da buna işarə etmiş və "Zadul-Məad" adlı əsərində "Rasulullahın (ﷺ) boşanma haqqının ərin əlində olub, başqasının haqqı olmadığına hökm etdiyinə dair qismdə (ez- Zurqaninin "Şərhu'l-Mevahib"inin haşiyəsində, VII. 201'də) belə demişdir: "Zikr edilən İbn Abbas hədisinin isnadında zəiflik varsa da, Quran onu dəstəkləməkdədir və fəqihlər də bununla əməl edərmişlər".

Bu surətlə hədis höccət (dəlil) olar və müxalifəti caiz olmaz.

Bəzən fiqh musannifləri[63] bir hökmün dəlilini zikr edərlər və onu mərfu bir hədis olaraq Rasulullaha (ﷺ) nisbət edərlər. Mühəddislər isə bunu Tabeindən filankəsin sözü olaraq təxric edərlər, bunu görən də fiqhi hökmün ortadan qalxdığını və kökündən ləğv edildiyini, buna görə də fəqihlərin fiqhi ilə müctəhidlərin ictihadının batil

60. Talaq surəsi, 1
61. Bəqərə surəsi, 231
62. Bəqərə surəsi, 228
63. Musannif - təsnif edən deməkdir, yəni bir kitabı başdan sona özü yazan - deməkdir. Müəllif isə, bir kitabı başqa kitablardan toplayaraq yazandır.

olduğunu zənn edər. Halbuki, bu məsələnin qəti və zənn ilə deyil qəti şəkildə sabit bir dəlili vardır.

Bunun misalı bəzilərinin günorta və ikindinin fərzində qiraətin səssiz ediləcəyinə və yüksək səslə oxunmayacağına dair istidlalıdır. Onların bu mövzudakı dəlili "Salahın-Nehəri Acməun: Gündüz qılınan namaz dilsizdir (səssizdir)" hədisidir. Halbuki, hədis batildir və mərfu olaraq əsli yoxdur. Bu sadəcə Mucahid (21-100-4), Əbu Ubeydə b. Abdillah b. Məsud (v. 80'dən sonra) kimi bəzi Tabeinlərin sözüdür. Bunu Hafız ez-Zeyla'i Nasbu'r-Rayədə, II. cildin başında və es-Səxavi, əl-Maqasidu'l-Hasənədə (s. 265, 266) və bunun bənzərini Abdurrazzaq, el- Musannəfində (II. 493) əl-Həsən əl-Bəsrinin (32-110) sözü olaraq nəql etmişlərdir.

Buna baxmayaraq, bu, fiqhi hökmün batil olmasını və gündüz namazlarında açıq şəkildə qiraət etməyi özümüzə mübah etməyimizi gərəkdirməz. Çünki, bu hökm əl-Buxarinin Həbbab bin əl-Ərati hədisilə sabitdir. Həbbabdan (r.a) "Rasulullah günorta və əsr namazlarında bir şey oxuyurdumu?" - deyə soruşduqda, O: "Bəli" - dedi. Biz "Oxuduğunu nədən bilirdiniz?" - deyə soruşduqda, "Saqqalının oynamasından" - cavabını verdi.

Səhih Muslimdə Əbu Said əl-Xudridən onun belə dediyi rəvayət edilmişdir: "Rasulullahın günorta və əsrdə qiyamda nə qədər qaldığını hesabladıq; günorta namazının ilk iki rükətində "Səcdə" surəsi oxunacaq qədər dayandığını, son iki rükətdə də bu müddətin yarısı qədər dayandığını gördük..."

İkisi də Səhiheyndə olan bu hədislərin məzkûr hökmü dəstəkləməsini, müsəlmanların bu hökmü nəsildən-nəsilə nəql etməsini və heç bir etiraz görmədən onlar arasında yayılmasını da əlavə etmək lazımdır. Bütün bunlar qətiyyət ifadə edir. O halda bu hökmün səhih olduğunu, özlərinə tabe olması və ya görüşlərinin qəbul edilməsi vacib olmayan sələfdən bəzilərinin sözündən ibarət məqtu bir hədisə deyil, səhih olduğu qəti olan bir dəlilə dayanan bir hökmdür.

Əslində zəif, lakin xarici şahid və dəlillərlə qüvvətləndirilmiş olan bu hədislərlə istidlal edənlər, sadəcə, bu hədislərin hökmə açıq

bir şəkildə dəlalət etdikləri üçün istidlal etmişdir. Yoxsa onların şəxsi qüvvələrindən ötrü yox.

Bütün bunların xülasəsi budur: Bugün əlimizdə mövcud fiqh kitablarında gördüyümüz zəif və bənzəri hədislərin bəzisi şəxsən imamın dəlilidir, bəziləri də (ki, bu xeyli saydadır) bunu dəlil olaraq qəbul edən müəllifin istidlallarıdır.

Hədislərin zəif olmağı bu hədisə istinad edən hökmün də zəif olduğu demək deyil. Çünki, bəzən Quran ayələrindən, bəzən də qətiyyətlə sabit səhih hədislərdən onu dəstəkləyən dəlillər tapılar.

**Dördüncü nöqtə:** Bəzən bir hədisin həm müctəhidə, həm də mühəddislərə aid tariqləri zəif olar, onu sabit və səhih qılacaq dəlillər də tapılmaz. Lakin imamın bununla məzhəbinə uyğun olaraq istidlalı başqa hədis tapılmadığı və əvvəl də qeyd etdiyim kimi, çox zəif olmadığı vaxt zəif hədislə dəlil göstərmə qəbilindən olur. Hədisin zəifi isə rəy və qiyasdan daha xeyirlidir.

Allah daha yaxşısını bilir.

# XÜLASƏ

## Sözün qısası biz:

**Müqəddimədə:** imamların, elmlərini sünnədən almadaki hərisliklərini, sonra fiqh və ictihadlarını bunlar üzərinə bina etdiklərini və insanları hədis öyrənməyə təşviq edib, rəydən uzaqlaşdırmağa çalışdıqlarını və fitnələrdən qurtulamağın Rasulullahın sünnəsinin kölgəsinə sığınmaqla olacağını, həlak olmaqdan sünnə sayəsində qurtulacağını gördük.

Sonra:

**Birinci Səbəbdə:** Hədislər əməl edilməyə nə zaman əlverişli olar məsələsi idi. Üzərində durulması lazım olan dörd nöqtə olduğunu dedik. Bunlar belədir:

a) Hədisin səhih olmasındakı bəzi şərtlərdəki ixtilaf və imamların səhih hədisin şərtlərində ixtilaf etdikləri və bəzi fiqhi ixtilafların bundan meydana gəldiyi,

b) Hədislələ əməl edilə bilməsi üçün, onun səhih olması şərtmidir? Cavabında, bir çox fəqih imamın və mühəddisin bu şərti qoşmadıqlarını, əksinə o məsələdə başqa hədis olmaması şərti ilə, zəyif hədislə əməl etməyə cəvaz verdiklərini və zəif hədislə əməl etməyi, qiyas ilə əmələ tərcih etdiklərini gördük.

Bəzi imamlar, hər hansı bir nassın, iki mənaya gəlməsi halında, bu zəif hədisdən başqa tərcih səbəbi olmadığında, iki mənadan birini tərcih etmək üçün zəif hədisə müraciət etmişlərdir.

Bu şəkildə zəif hədisə müraciət edənlərin, etməyənlər ilə arasında bəzi ixtilaflar meydana gəlmişdir.

c) Hədisin ləfizlərinin təsbitinin zəruri olması (ləfzən və məna olaraq rəvayət)

Burada, bunun tətbiqi misalını gördük. O da "Çatmadıqlarınızı tamamlarsınız" və "Çatmadıqlarınızı qəza edərsiniz" hədislərində ravilərin bir tək kəlmədəki ixtilafıdır. Bu səbəblə Əbu Hənifə, məna olaraq rəvayət etmək istəyən üçün, başqalarının belə birisinin ərəb dilini yaxşı bilməsini şərt qoşmağından əlavə, fəqih olmasını da şərt qoşmuşdur.

d) Hədislərdəki  kəlmələrin oxunuşunun təsbiti. Burada da fəqih imamların, şəri olaraq boğazlanan bir qoyunun qarnından çıxan cənin (yavrunun) yeyilməsinin halal olub olmadığındakı ixtilaflarında, bu xüsusun rolunu göstərən bir misal gördük. Bu ixtilaf, bir çox səbəbdən meydana gəlmişdir. Birisi "zəkətul cənin zəkətu ummihi" hədisində, hər iki "zəkət" kəlməsi mərfumudur yoxsa mənsubmudur?

Yoxsa birinci mərfu ikinci mənsubmudur?

Bu səbəblə əlaqəli açıqlamaların sonunda, bu xüsusda ortaya çıxan iki şübhəni ərz etdim, bunlar:

1 – Səhih hədis varsa mənim məzhəbim odur.

2 – Hədisin səhih olması, onunla əməl edə bilmək üçün kifayətdir.

İmamların "səhih hədis varsa mənim məzhəbim odur" sözü ilə, "səhih bir hədis varsa və əməl edilməyə əlverişli olub, onunla zidd olan başqa xüsuslar yoxsa..." demək istədiklərini və bu sözün muxatabının özləri kimi imamlar, keçmiş alimlərdən bəzilərinin bu sözü tətbiqə girişdiyini və xətaya düçar olduqlarını və ya o hökmü tətbiqdə tərəddüt içərisində qaldığını və bizim bundan dərs və ibrət almağımız lazım olduğunu, geniş bir şəkildə açıqladım.

Eyni ilə "hədisin səhih olması, onunla əməl edə bilmək üçün kifayətdir" deyənin xətasını, bu sözün də, bir əvvəlki kimi olub, bunun cavabının əvvəlki sözün cavabı ilə eyni olduğunu açıqladım.

Sonra bəzilərinin "biz Rasulullaha tabe olmaqla əmr olunduq" başqasına deyil deməlerinə təmas etdim və buna cavab olaraq, imamların ictihadlarında Rasulullaha tabe olduqlarını və Ona tabe olmağa həris olduqlarını dedim.

İmamların dəlilləri arasında tərcih etməyə əhil olmayan birisinin, hər hansı bir məsələdə, bir məzhəb imamının dəlilinin açıq olmasına dayanaraq, fərqli məsələlərdə bir məzhəbdən digərinə keçməyin təhlükəsini də açıqladım.

**Sonra İkinci Səbəbdə:** İmamların hədisləri anlamadakı ixtilaflarını acıqladım. Bu ixtilaf iki xüsusdan ibarət idi.

1 – Gərək fitrətdən, gərək sonradan qazanmaq yolu ilə olsun, anlayış və idraklarındakı fərqliliklərdən,

2 – Hədisin ləfzinin birdən çox mənaya gəlməsinin mümkün olması kimi, xüsuslardan doğduğunu anladıq.

İmam Əbu Hənifənin əl Amaş ilə və Muhamməd bin əl Həsənin İsa bin Əban ilə və İmam Əhmədin İmam əş Şafi ilə müzakərə etməsi kimi bunun misallarını zikr etdim.

Sonra mühüm və təhlükəli bir xüsusa diqqət çəkdim. O da, fiqhin dindən ayrı bir şey olmadığı, çünki fiqhin, kitab və sünnənin anlaşılması, təfsir  və şərhi olduğunu və fiqhin dindən ayrı qəbul edilməsinin dinin tamamını ortadan qaldıracağı, Kitab və Sünnəni mücərrəd nasslar halına qoyacağı xüsusi idi.

Daha sonra, öz anlayışını insanlara "Kitab və Sünnət Fiqhi" şəklində və keçmiş imamların fiqhinə etibar etmədən təqdim edənlərin xətalarına diqqət çəkdim. Onlara görə məsələ, Əbu Hənifənin fiqhinin kitab və sünnətlə əlaqəsi olmayıb sadəcə Əbu Hənifəyə aiddir. Öz fiqhləri isə Kitab və Sünnətin fiqhidir!

Zahirən bir-birinə zidd kimi görünən hədislərin arasını cəm etmədəki ixtilafları ilə əlaqəli üçüncü səbəbdən danışarkən, bir-biriləri

ilə zidd kimi görsənən hədislərin arasını təlif etmədəki mərhələləri, öncəliklə ikisinin arasının cəm ediləcəyini, bu mümkün olmazsa, birisinin nəsx digərinin mənsux qəbul ediləcəyini, bu da mümkün olmazsa, ikisindən birinin tərcih ediləcəyini gördük.

Nəsx iddiasında olmağın kor koranə edilə bilinməyəcəyini, nəsxin usul və səbəbləri olduğunu və bunun çətin bir iş olduğunu da gördük.

Eyni şəkildə, iki zidd hədisi cəm etməyin çətinliyini, bunun parlaq bir anlayış və geniş bir araşdırma istədiyini, bir-birinə zidd görünən iki hədisdən birini tərcih etmədə təqib ediləcək yolların çox olduğunu, Hafiz İraqinin bunların sayısını 110-a qədər çıxartdığını və bunların xaricində başqaları da olduğuna işarət etdiyini gördük.

Sünnəyə hakim olmalarındakı genişliyin fərqli olmasından doğan ixtilaflarla əlaqəli dördüncü səbəbdən bəhs edərkən,bəzi həqiqətlərə şahid olduq.

**Birinci həqiqət:** İmamlar sünnəyə geniş bir şəkildə hakim idilər. Bununla birlikdə onların heç biri, tək başına sünnənin tamamını bilmirdilər.

**İkinci həqiqət:** Bəzi açıqlamalar etmək sürəti ilə, Əbu Hənifənin sünnəyə hakimliyinin genişliyi üzərində durdum, nəqillər gətirdim və buna dəlalət edən müxtəlif qissələr zikr etdim. Ancaq, çox hədis eşitmiş, əzbərləmiş və çox hədisə vaqif olmuş olmasına baxmayaraq O, insanlara çox az hədis rəvayət edərdi.

**Üçüncü həqiqət:** Bəzi imamlara, özlərinin qəbul etməkdə olduqları bir neçə görüşlərinə və verdikləri fətvalara muxalif bir hədis rəvayət edildiyi zaman, onlar bu görüşlərindən dönmüşlərdir və daha öncə bu hədis qarşılarına çıxmamışdır.

Sonra bu səbəbi, səbəblərin ən sonunda zikr etməyimlə əlaqəli bir suala təmas etdim və belə etmənin, təbii və məntiqli olduğunu açıqlayaraq cavab verdim.

Daha sonra, bu səbəbə yönələn üç şübhəni zikr etdim və cavablandırdım. Bunlar:

1 – İmamlar bəzi hədisləri görməmişlərdir. Bu, o imamları, eyni məsələdə başqa şeyləri, başqa bir məsələdə də daha başqa şeyləri görməmiş olma ehtimalı ilə qarşı-qarşıya gətirər. O halda yaxşıca mutmain olmaq üçün, dəlili biz özümüz araşdırmalıyıq.

Buna, hər imamın əshabının bu nöqsanlıqları tamamlayıb açıqladıqları və nadir olanın hökmünü kullə şamil etməyin ağla və elmi usullara muxalif olduğu cavabını verdim.

2 –Bəziləri bugün hədis kitablarından istifadənin köhnədən olduğundan daha asan olduğunu və bu hədislərdən və ya mövcud məzhəblərdən istifadə edərək, yeni bir fiqh məzhəbi qurmağın və əlimizdə bir çox mövcud hədis kitabına dayanaraq, dəlili ən qüvvətli olan görüşü təsbit etməyin mümkün olduğunu iddia etmişlərdir.

Bunun cavabı: Bug ün mövcud ən geniş hədis kitabındakı hədislərin sayısı, imamların vaqif olduqları və ya kitablarında zikr etdikləri rəvayət edilən hədislərdən çox daha azdır. Üstəlik bu kitabdakı bir çox hədisin sənədlərinin araşdırılması lazımdır. Halbuki bu kitabın qaynaqlarını tədqiq etmək və sonra onlardan istifadə etmək mümkün deyildir.

Hədislərin sayısının çoxluğu da bu məsələdə ilk və son əsas deyildir. Bunun xaricində, bir çox ixtilaf səbəbləri vardır ki, bunların bəzilərini zikr etdim, bəzilərini zikr etmədim.

Müctəhid sadəcə sünnəni bilməklə mükəlləf deyildir. Bundan əlavə, əməli saleh, ibadət və təqva ilə yanaşı lazım olan bir çox şərtlər vardır. Bu son şərtə dair hədislərdən dəlillər zikr etdim.

3 – Bəziləri, əlimizdə mövcud fiqh kitablarında zəif, mövzu vs. hədislərin olmasına etiraz etmişlər və bu hədislərin imamın dəlilləri olduğunu zənn etmişlərdir. Onların zənn etdiyi kimi olsaydı, biz bu imamın imam olduğunu qəbul edərdikmi?

Yenə onların bu hədislərin imamın dəlilləri olduğunu, bu dəlillər zəif olduqda hökmünün də zəif olacağını zənn etmişlərdir. Buna, mühüm bəzi açıqlamalar ilə cavab verdim:

A – Fiqh kitablarında hədislərin bəzisi imamın dəlilidir, bəzisi də sadəcə fiqh kitabının müəllifinin öz istidlallarıdır.

B – Bu hədislərin zəif olması, bu hədisləri təxric edən mühəddislərin sahib olduqları isnadlara görədir, məzhəb imamının sahib olduğu isnadlara görə deyildir. İmamların özlərinə xas isnadları vardır. Buna misal olaraq. “Şübhəli hallarda hədd cəzalarını qaldırın” - hədisini zikr etdim.

C – Bəzən fəqih bir hədisi  bir hökmün dəlili olaraq zikr edər və hədis zəif olar, fəqət onu dəstəkləyən son dərəcə qüvvətli şahidlər və təyid edici dəlillər tapılar. Fəqih bu zəif hədisi sadəcə, o hökmə açıq bir şəkildə dəlalət etməsindən ötrü seçmişdir.

Buna dair, birisi “Boşama haqqı, ancaq qadınla evlilik münasibətində olana aiddir”, digəri “Gündüz qılınan namazlar dilsizdir” hədisi olmaq üzərə iki misal verdim.

D – Bəzən hədis zəif olar, onu dəstəkləyən bir şey də tapılmaz, lakin imam, o məsələdə başqa bir hədis olmadığı zaman zəif hədislə əməl etməyi tərcih edər və bu təqdirdə zəif hədislə əməl etməyi, qiyasla əməl etməyə tərcih etməsindən ötrü, bu zəif hədisi dəlil olaraq istifadə edər. Allahu Aləm.

Allahın subhənəhu və təalə, xülasə edərək təqdim etməyi müyəssər etdikləri burada tamamlandı. Mövladan, bu əsəri doğru yola vəsilə etməsini, ihsan edəcəyi fəziləti ilə, verəcəyi əcr və savabı artırmasını diləyirəm. O, hər yaxşılığın və nemətin sahibidir. Allah, əfəndimiz Muhamməde və Onun əhli-beytinə və əshabına salat və salam etsin.

Həmd aləmlərin Rəbbi olan Allahadır.

***Muhamməd Avvamə***

*Hələb*
*Cəmiyyətut Təlimiş Şəri*
*7 Rabiul Əvvəl 1397*
*26 Fevral 1977*

# İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYAT


əl Bəhrur-Raqaiqu Şərhu Kənzid Dəqaiq, İbn Nüceym, Mətbəə-tul-İlmiyyə, 1311

Buğyətul-Vuat, əs-Suyuti, əs-Səadə nəşrinin ofseti

Cəmiu Bəyanil Elm, İbn Abdilbərr, Beyrut

əl-Cərhu vəl Tədil, İbn Əbi Xatim, Beyrut

əl-Cəvahirul-Mudiyyə fi Təbaqatil-Hənəfiyyə, əl-Quraşi, Heyda-rabad 1332

Dəf-ul Əvham an Məsələtil Qiraəti Xalf əl İmam, Abdulğaffar Uyunus-Sud, Xumus 1927

əl-Ənsab, əs-Səmani

Fədlu Elmis-Sələf aləl Xaləf, İbn Rəcəb.

əl-Fəqih vəl-Mütəfəqqih, əl-Xatib əl-Bağdadi, Darul Qutubil-El-miyyə 1395.

Fəthul-Bari bi Şərhi Səhihul-Buxari, İbn Həcər. Mustafa əl-Babi nəşri 1395.

Fəthul- Qədir, İbn əl-Hümam, Mustafa Muhamməd nəşri 1378.

Fəthul-Muğis, əs-Səxavi, Mətbəətul Əsimə 1388.

Fiqhu Əhlil-İraqi və Hədisuhum, əl-Kövsəri, Beyrut 1390.

Xaşiyətus-Sindi alən-Nəsai, Bax:Sünəni-Nəsai.

əl-Xavi fi Sirətit-Təhavi, əl-Kövsəri, əl-Ənvər nəşri 1368.

əl-Xayratul-Hisan fi Mənaqibi Əbu Hənifətin-Nüman, İbn Hə-cər əl-Heytəmi, Darul-Qutubil-Arabiyyə 1326.

əl-Hidayə, əl-Mərğinani (Fəthul-Qədir şərhi ilə birilikdə)

İxtilaful-Hədis, əş-Şafii (əl-Umm içərisində) ət-Tibəətul-Fənniyyə 1381.

İləm-ul-Muvaqqiin an Rabbil-Aləmin, İbn əl-Qayyim, Mətbəətus-Səadə 1374.

Incə ul-Vatani anil-İzdirai bi İməmiz-Zəmən, Zəfər Əhməd əl-Osmani ət-Təhanəvi, Qaraçi 1374.

əl-İntiqau fi Fadailil Əimmətis- Sələsətil-Fuqəha, İbn Əbdilbərr, əl-Qudusi nəşri 1350.

əl-İtibər fin Nəsx vəl Mənsux minəl-Əsər, əl-Xazimi, Hələb 1346.

Qavaidu fi Ulumil Hadis, Zəfər Əhməd əl-Osmani ət-Təhanəvi, Darul-Qələm, Beyrut 1392.

Kəşfuz Zunun ən Əsamil-Qutub vəl-Funun, Hacı Xəlifə (Katib Çələbi) İst.1360.

əl-Kifayə fi Elmi-r-Rivayə, əl-Xatib əl-Bəğdadi, Heydarabad 1347.

Məqalatul-Kövsəri, əl-Ənvar nəşri 1373.

əl-Məqasidul-Hasənə, əs-Səxavi, Darul-Ədəbil-Arabi 1375.

Manə Qavlil-İmamil-Muttalibi: İzə Sahhal-Hədisu fə Huvə Məzhəbi, əs-Subki (əs-Rəsailul-Muniriyyə içərisində) 1970 nəşri.

Məcməzu-Zəvaid və Mənbaul-Fəvaid, əl-Heysəmi, əl-Qudusi nəşri 1352.

əl-Məcmu, ən-Nəvəvi, Zəkəriyyə Əli Yusuf nəşri.

əl-Məcruhin, İbn Hibban, Darul-Vay nəşri, Hələb 1396.

Mənaqibu Əbi Hənifə və Sahibəyni, əz-Zəhəbi, İhyaul-Maarifin-Numaniyyə nəşri, Hindistan.

Mənaqibul-İmam Əbi Hənifə, Aliyyul Qari. Bax: əl-Hanci nəşrinin ofseti.

Mənaqibul-İmam Əhməd, İbn əl-Qayyim, əl-Hanci nəşrinin ofseti.

Mənaqibul-İmam Şafi, əl-Beyhəqi, Darut-Turas 1391.

Miftəhul Cənnə fil-İhticəci bis-Sünnə, əs-Suyuti, (ər-Rəsailul-Muniriyyə içərisində) 1970 nəşri.

Mirqatul-Məfatih Şərhu Mişqatul Məsabih, Aliyyul Qari, Bombey nəşri.

əl-Minhəc bi-Şərhi Muslim əl-Həccac, ən-Nəvəvi, Mətbəətul-Misriyyə.

əl-Mizanul-Kübra, əş-Şərani, Mətbəətul-Meyməniyyə 1306.

əl-Muhallə, İbn Xazm, əl-Mətbəətul-Muniriyyə 1347.

əl-Müsənnəf, Abdurrazzaq, əl-Məclisul-İlmi nəşri, Hindistan 1390.

əl-Müsənnəf, İbn Əbi Şeybə, Hindistan daş nəşri.

əl-Müsnəd, Əhməd bin Hənbəl, Beyrut 1389.

əl-Müsnəd, İmam Əbu Hənifə, Şirkətul-Mətbuayil-İlmiyyə 1327.

əl-Muvatta, İmam Malik (Tənvirul-Havəlik haşiyəsilə birlikdə) Mətbəətul-Məşhədil-Huseyni.

Neylul-Əvtar, əş-Şövkani, Mustafa əl-Babi əl-Hələbi 1371.

ən-Nihayə fi Ğaribil-Hədis, İbnul-Əsir, İsa əl-Bəbi nəşri 1383.

ən-Nukətut-Tarifə, əl-Kövsəri, əl-Ənvar nəşri 1365.

Rəddul-Muxtar (Haşiyətu ibn Abidin) Mustafa əl-Bəbi nəşri 1386.

əs-Risalə, əş-Şafi, Mustafa əl-Bəbi nəşri 1358.

ər-Ruh, İbn əl-Qayyim, Muhamməd Əli Sabih nəşri 1369.

Səhihul-Buxari. Bax: Fəthul-Bari.

Səhihu-Muslim. Bax: əl-Minhəc, ən-Nəvəvi.

əs-Səkəfətul-İslamiyyə, Muhammməd Rağib ət-Tabbah, Hələb 1369.

Sünənud-Darimi, Mətbəətul-İtidal, Dəməşq (Şam) 1349.

Sünənu Əbi Davud, bi-Şərhi Avnil-Mabud, Hindistan.

Sünəni ibn Macə, Muhammməd Fuad Abdulbaqi nəşri.

Sünənu-n-Nəsai, əl-Misriyyə nəşri 1348.

Şərhu-İləlit-Tirmizi, İbn Rəcəb, Təhqiq: Nreddin Itr, Dəməşq 1398.

Şərhu Müsnədi Əbi Hənifə, Aliyyul Qari, Hindistan 1379.

Şərhu-Muvatta, əz-Zurkani, Mətbəətul-İstiqamə 1379.

Şərhu Nuhbətil-Fikər, İbn Həcər (Laktud-Durər haşiyəsilə birlikdə) Mustafa əl-Bəbi nəşsi 1383.

Tabaqtuş-Şafiiyyətul-Kübra, əs-Subki, İsa əl-Bəbi nəşri 1383.

Təqdimətul-Cərhi vət-Tədil, İbn Əbi Xatim, Beyrut 1371.

Təqdimətu Nasbur-Rayə, əl-Kövsəri, Darul-Məmun 1375.

ət-Təqyid vəl-İzah Haşiyətul-İraqi alə İbnis-Saləh, Hələb 1350.

Tarixu Bağdad. əl-Xatibul-Bağdadi, Mətbəətus-Saədə 1349.

Tədribu-r-Ravi, əs-Suyuti, əl-Məktəəbətul-İlmiyyə 1379.

Təhzibul Əsma vəl-Luğət, ən-Nəvəvi, Təbatul-Muniriyyənin nəşri.

Təhzibut-Təhzib, İbn Həcər, Beyrut nəşri.

Tənibul-Xatib, əl-Kövsəri. əl-Ənvar nəşri 1361.

Tənsikun-Nizam Şərhu Musnədil-İmam (Əbi Hənifə), əs-Sunbuhli, Qəraçi.

Tətribul-Mədarik, Qadi İyad, Məktəbətul-Hayət 1387.

Təzkirətul-Huffəz, əz-Zəhəbi, Beyrut 1375.

Tuhfətul Mevdud bi-Əhkamil-Məvlud, İbn əl-Qayyim, Bombey 1380.

Uqudul-Cuman fi Mənaqibi Əbi Hənifətən-Numan, əs-Salihi, İhyaul-Maarifin-Numaniyyə, Heydarabad 1394.

Zadul Məad, İbn əl-Qayyim, (əz-Zurkaninin Şərhul-Məvahibi ilə birlikdə), əl-Əzhəriyyə nəşri 1325.

# MÜNDƏRİCAT